**AZƏRBAYCAN AŞIQLAR BİRLİYİ**

**Ozan dünyası** **№2(13), 2013**

*Millətimi saz anladar, saz anlar,*
*Saza baxsın tariximi yazanlar.*

*Zəlimxan Yaqub*
*Xalq şairi*



**Ünvan:** Bakı, Zərifə Əliyeva küç. 53
**Əlaqə telefonları:**
( + 994 12) 493 86 61
(+994 50) 345 36 52
musa58@bk.ru

**Zəlimxan YAQUB**
**Xalq şairi**



# XALQ YAZIÇISI ANARA AÇIQ MƏKTUB

Hörmətli Anar müəllim!

Mən sizin əsərlərinizi həmişə sevə-sevə oxumuşam, bu gün oxuyuram, sabah da oxuyacağam! Dədə Qorquddan bu günümüzə qədər elə bir görkəmli şəxsiyyət yoxdur ki, siz onun haqqında öz gözəl fikirlərinizi bildirməmiş, yazmamış olasınız. Dədə Qorqud müdrikliyi də, Nizami dühası da, Füzuli həsrəti də, Nəsimi əqidəsi də, Xətai böyüklüyü də, Cavad xan fədakarlığı da, Natəvan kövrəkliyi də, Mirzə Fətəli dərdi də, Mirzə Cəlil həqiqəti də, Sabir üsyankarlığı da, Cavid ağrısı da, Hadi faciəsi də, Müşfiq yarası da, Cabbarlı dünyası da, Şəhriyar nisgili də sizin qələminizin qüdrətiylə daha da büllurlaşıb, aydınlaşıb, gözəlləşib və oxuculara təqdim olunub. Rəsul Rzanın və Nigar Rəfibəylinin – iki böyük şəxsiyyətin ailəsində, ədəbiyyat ocağında dünyaya gəlmək Allahın sizə ən böyük lütfü, ən gözəl hədiyyəsidir. Müasir ədəbiyyatımızın demək olar ki, bütün nümayəndələri ilə həmdərd, həmnəfəs olmusunuz. Bundan böyük xoşbəxtlik ola bilərmi?

XX əsrdən XXI əsrə ürəyi dolu, qələmi və ilhamı dolu gələn Anar müəllim!

Siz kimlərdən və nələrdən yazmamısınız. Azərbaycandan, onun keçmişindən, bu günündən, gələcəyindən, Türkçülükdən, türk dünyasının milli və bəşəri problemlərindən, dilimizin adından və taleyindən, azadlığımızdan, müstəqilliyimizdən, istiqlalımızdan, bu yollarda gördüyünüz çətinliklərdən, çəkdiyiniz ağrı-acılardan, Dağlıq Qarabağ faciəsindən, 20 Yanvar hadisələrindən, Azərbaycanın başına gətirilən müsibətlərdən, sapı özümüzdən olan baltaların özümüzə qarşı münasibətindən, xalqımız üçün lazımlı və gərəkli olan mövzulardan.

Siz kimlərdən yazmamısınız? Sizin ömrünüz bir ədəbiyyat ensiklopediyasıdır. Orda Azərbaycanla bağlı istənilən tarixi hadisəni, istənilən tarixi şəxsiyyəti axtarıb tapmaq, oxumaq, öyrənmək, ucalmaq və böyümək olar. Bunun üçün görən göz, döyünən ürək, düşünən ağıl lazımdır. O ensiklopediyada N.Nərimanov da var, M.Ə.Rəsulzadə də, Aşıq Ələsgər də var, Səməd Vurğun da, Nazim Hikmət də var, Rəsul Rza da, Üzeyir bəy də var, Qara Qarayev də, Səttar Bəhlulzadə də var, Tahir Salahov da, Süleyman Rüstəm də var, Almas Yıldırım da, İsmayıl Şıxlı da var, Bəxtiyar Vahabzadə də, Mirvarid Dilbazi də var, Nigar Rəfibəyli də, Ənvər Məmmədxanlı da var, İlyas Əfəndiyev də, Mirzə İbrahimov da var, Çingiz Aytmatov da, Osman Sarıvəlli də var, Hüseyn Arif də, Rəsul Həmzətov da var, İmran Qasımov da, Nəbi Xəzri də var, Qabil də, İsa Hüseynov da var, Mövlud Süleymanlı da, Elçin də var, Fikrət Qoca da, Məmməd Araz da var, Tofiq Bayram da, Nəriman Həsənzadə də var, Cabir Novruz da, Yusif Səmədoğlu da var, Vaqif Səmədoğlu da, Kamal Abdulla da var, Çingiz Abdullayev də, Ramiz Rövşən də var, Sabir Rüstəmxanlı da, Afaq Maqsud da var, Rafael Hüseynov da, Vaqif Bayatılı da var, Rəşad Məcid də... Bu adları istənilən qədər artırmaq olar. Ancaq bu fikir kifayətdir ki, müasirlərimizin əksər nümayəndələri haqqında ürək genişliyi ilə söz açmaq hər oğulun hünəri, hər kişinin işi deyil. “Min beş yüz ilin oğuz şeiri” antologiyasını araya-ərsəyə gətirmək də sizə qismət olub. İki cilddə bu kitabların dünyaya gəlməsi üçün antologiyalardan, müntəxablardan, şeir toplularından, türk və rus dillərində olan çoxlu sayda əsərlərdən, kitablardan istifadə olunub. Bu kitablar bütövlükdə quzeyli, güneyli Azərbaycanın və bütövlükdə Türk dünyasının mənəviyyatını əks etdirir. Bu kitablar ədəbiyyat tarixində həmişə qalacaq və oxunacaq kitablardır. Ədəbiyyata ən böyük xidmət elə budur. Bu kitablar çoxları kimi mənim də stolüstü kitablarımdır.

Antologiya 1500 ilə güzgü tutan bir aynaya bənzəyir. Bu aynada Qaşğarlı Mahmud da var, Yusif Balasaqunlu da, Əhməd Yəsəvi də var, Yunis Əmrə də. Orxon Yenisey yazılarından başlamış “Tariximizin uca yaddaşı” adlı son sözə qədər nə varsa, hamısı böyük zəhmətin, uzun illərin, yuxusuz gecələrin, türk şeirinə, onun bütün qollarına dərindən bələd olmağın bəhrəsi, sonsuz axtarışların nəticəsidir. Bu nəticə yenidir, təzədir, təravətlidir, ona görə ki, bu kitab türk dillərinin müştərək abidəsidir. Bu abidə əbədi abidədir. Ədəbiyyata bundan böyük nə xidmət ola bilər! Ancaq təəssüf edirəm ki, bu kitablarla bağlı dövrü mətbuatda samballı, layiqli yazılara rast gəlməmişəm!

Ulu öndərimiz Heydər Əliyevlə bağlı yazdığınız yazılar sizin ömrünüzdə ayrıca bir fəsildir. Bu fəsil tədqiq və təbliğ olunmalıdır, ona

görə ki, ümummilli liderimiz Heydər Əliyevin yaşadığı ömür onu yetirən xalqın, dövlətin, dövlətçiliyin ömrüdür. Ziyalılığın və ziyalıların ömrüdür.



Hörmətli Anar müəllim!

İctimai-siyasi xadim kimi, yazıçı və dramaturq kimi, çoxlu sayda ssenarilərin müəllifi kimi, klassiklərimiz və müasirlərimiz haqda bir-birindən qiymətli məqalələrin müəllifi kimi sizi təbrik eləmək, sizin haqqınızda ən xoş söz demək, ən gözəl fikirlər söyləmək olar.

Mən sizin yaradıcılığınız haqqında geniş fikirlər söyləmək iddiasında deyiləm. Bu, mümkün də deyil. Çünki zəngin yaradıcılıq sahibi haqqında geniş fikir söyləmək çox çətindir. Bu, bir məqalənin yox, kitabların, dissertasiyaların mövzusudur, ədəbiyyatşünasların fəaliyyətinə aiddir.

Mən sizin "Azərbaycan" jurnalının 2013-cü il, 3-cü nömrəsində "Sabahın sətiri" adlı ədəbi ssenarinizi böyük maraq və məhəbbətlə, acgözlüklə oxudum. Çünki bu ssenaridə təkcə Mirzə Fətəli Axundovun yox, eyni zamanda onun müasirlərinin portretləri, taleləri, ömür-gün yolları, gördükləri çətinliklər, xalq, millət naminə gördüyü işlər çox gözəl işıqlandırılıb. Əsərdə Bodenştet də var, Mirzə Şəfi də, Bestujev Marlinski də var, Lermontov da, Abbasqulu Ağa Bakıxanov da var, Puşkin də, Həsən bəy Zərdabi də var, Nəcəfbəy Vəzirov da. Mirzə Fətəlinin obrazını bütünlükdə canlandırmaq üçün müasirlərin dili ilə onun fəaliyyətinə hərtərəfli bir baxış var. Bu baxışların hamısında Mirzə Fətəlinin

böyüklüyü, faciəli ömür yolu, Arazın o tayından gələn bir uşağın 66 yaşında dünyasını dəyişənədək bütün hadisələr genişliyi ilə verilir.

Mirzə Fətəlinin əsərlərini yaradan köklər, səbəblər, hadisələr, Mirzə Fətəlini yetirən mühit çox gözəl açılır. Ssenaridə göstərilən həkim Müsyo Düpon da, Tubu xanım da, Nisə xanım da, Rəşid bəy də, Mirzə Fətəlinin atası Məmməd Tağı da, Axund Ələsgər də, məşhur müğənni Səttar da – hamısı Mirzə Fətəlinin taleyini işıqlandırır.

Mirzə Fətəlinin obrazları yenidən dilə gəlir. Teymur Ağa da, Molla İbrahimxəlil də, "Yuxulu"lar da, Molla Həmid də, Dərviş Abbas da, Məstəli Şah da, Hacı Qara da, Xacə Məsud da, Pəri xanım da, Şərəfnisə də, Heydər bəy də, Əsgər bəy də yenidən xəyalımızda canlanır. Görün son mənzilə yola salmaq üçün Mirzə Fətəlinin taleyini kimlər müzakirə edir.

"Molla İbrahimxəlil:

– Bu dinsizi nəbadə müsəlman qəbiristanlığında basdırasınız, bu mürtədin mömin müsəlmanların arasında yeri yoxdur, aparıb harda istəyirlər başqa yerdə basdırsınlar.

Məstəli şah deyir:

– Bu kafirin dəfnində iştirak etmək də günahdır. Onun dəfnində iştirak edən hər kimsə elə günaha batacaq ki, o dünyada cəhənnəm zəbanəsində yanacaq.

Lənkəran xanın vəziri:

– Bu məlunun qəbrini elə dərin qazın ki, xortlayıb ordan çıxa bilməsin, yenə də camaatı bizə güldürməsin".

Həyat çox maraqlı, zaman çox ədalətlidir. Mirzə Fətəlinin taleyinə quyu qazmaq istəyənlərin heç birinin izi-tozu qalmayıb. Ancaq Mirzə Fətəlinin kədərli çöhrəsi, uca şöhrəti, heykəlləşən ömrü bu gün də hamını düşündürür. Ədəbiyyatımızda bir Mirzə Fətəli ucalığı var ki, o ucalıq həmişə zirvədə qərar tutacaq.

Yazdığı əsərlərin heç birinin səhnə təcəssümünü görə bilmir.

"Mirzə Fətəli:

–Teatro əsəri səhnədə oynamaq üçün yazılır. Səhnəmiz var ki, əsəri də oynasınlar?

Zərdabi:

– Bildiyimə görə "Müsyo Jordan"ı Tiflisdə oynayıblar.

Mirzə Fətəli:

– Bəli, rus dilində. Amma mən, onu türk dilində yazıram. Bə nə zaman mənim xalqım öz doğma dilində səhnədə görəcək?

Zərdabi:

– Darıxmayın Mirzə, o gün də gələcək."

Əlifba islahatı ilə bağlı Türkiyəyə səfər edir. İrana məktub yazır, ancaq dediyi təklifə əməl olunmur. Əlifba məsələsi həll olunmamış qalır. Ona görə ki, Türkiyədə sədri-əzəm Fuad paşa əlifbamızın taleyini Aleksandr bəylərə, Akop bəylərə həvalə edir (biri erməni, biri cuhud). Mirzə Kazım bəy kimi bir alimin, Ziya Paşa ilə birlikdə "Hürriyyət" qəzetini çıxaran vətən şairi Namiq Kamalın, Fransa və Hindistan alimlərinin əlifba ilə bağlı fikirləri nəzərə alınmır. Ortaya çoxlu əmmalar, bəlkələr çıxardırlar.

"İndi mənim bütün fikrim-zikrim əlifba məsələsidir. Ərəb hürufatını dəyişmək arzusu ilə hazırlaşıram axirət səfərinə", – deyən Mirzə Fətəli əlifbanın dəyişildiyi günü də görə bilmir.

Dilimizin, dinimizin, millətimizin, mədəniyyətimizin, maarifimizin taleyi, dərdi, problemləri ilə bağlı Mirzə Fətəlinin Həsən bəy Zərdabi ilə söhbətləri olduqca düşündürücü və maraqlıdır.

Millətin iki böyük oğlu öz xalqının taleyi, keçmişi, bu günü və gələcəyi haqqında dərdləşir.

"Mirzə Fətəli (Zərdabini qucaqlayaraq):

– Mənim kimi qəmlərə mübtəda olan, müasirlərin qabiliyyətsizliyindən, anlamazlığından təngə gələn əziz qardaşım. Qəm yemə. Gələcək nəsillər biləcək ki, millətimizin yolunda biz nə çəkmişik. Bizim arzularımızı onlar həyata keçirəcək".

Mükafatını öz vicdanından alan gənc Həsən bəy Zərdabi can üstündə olan Mirzə Fətəliyə ürək açan sözlər desə də, Mirzə Fətəli dövrdən, zamandan, insandan gördüyünü görmüş, çəkdiyini çəkmişdi. Mirzə Fətəlinin dərdli-qəmli söhbətlərinə Zərdabi belə cavab verir. "Bilirəm, Mirzə, dünya belə gəlib, belə də gedəcək, vilayət nadansız olmaz. İntəhası, iş nadanların çoxluğunda, azlığındadı. Bizdə axı deyəsən bir az çox olub. Nə isə, başınız çox ağrıtdım, mən gedim".

Ssenaridəki Mirzə Fətəlinin vəsiyyətindən bir parçanı oxuculara çatdırıram. "Ömrüm boyu mən xalqa namusla xidmət etmişəm, vəsiyyətim də var. Bilirəm, mən öləndən sonra gəlib evi ələk-fələk edəcəklər, görsünlər, yazıdan-pozudan nəyim qalıb – nə yazmışamsa hamısı senzordan keçib, izinlə basılıb. Xilafi-hökumət bir yazım yoxdur. Amma... Bax, o sandığı görürsən? Onun dibində, matrasın altında kamallüdövlənin əlyazmalarını gizləmişəm. Nəbadə xəbər tutarlar. Vaxtı gələndə Rəşidlə onu basarsınız. Amma nəbadə mənim adım olsun. Mənə day bir şey edə bilməzlər. Sümüklərim də çürüyəcək o vaxta, amma sizləri incidə bilərlər. Odur ki, basanda mənim adım olmadan çap edin. Çalışın tək türkcə yox, farsca, rusca, fransızca da basılsın. Həyatımın ən böyük arzusu bu idi". Görün bu vəsiyyətin altında nə qədər kədər yatır! Bu kədər xalqın

taleyindən, vətənin əhvalından, əsərlərinin çapından, əlifbamızın, dilimizin vəziyyətindən nigaran bir ürəyin kədəridir.

Ssenaridə rusca verdiyiniz mətnlərdə mətləb daha dərinə gedir. Tiflisin müxtəlif yerlərində, M.F.Axundovun evində Mirzə Fətəlinin, A.Bakıxanovun, B.Marlinskinin görüşlərində təkcə Azərbaycanın yox, Rusiyanın, Türkiyənin, İranın, Dağlıların vəziyyətindən, şərqlə qərbin münasibətlərindən söhbət gedir. Puşkinin ölüm xəbəri insanları sarsıdır. Qriboyedovun, Lermontovun, Puşkinin, M.Rılskinin vaxtsız və faciəli ölümləri dövrün, zamanın bəlası kimi meydana çıxır, danteslər öz işini görür. Ölən xalqın böyük oğullarıdır. Danteslər, Puşkinlər üz-üzə dayanır. M.Fətəli "Puşkinin ölümünə şərq poema"sını yazır. Lermontova Aşıq Qəribdən danışır. Bütün hadisələrin və insanların fonunda Mirzə Fətəlinin böyüklüyü, uzaqgörənliyi üzə çıxır.

Əzizim, Anar müəllim!

Ziyalılarımızın başına çox oyunlar açılıb. Bu biabırçılıqlar bu gün də davam edir. Cəlil Məmmədquluzadə, Üzeyir bəy, Səməd Vurğun, Rəsul Rza, Mirzə İbrahimov, Qara Qarayev kimi xalqın böyük oğullarına, hətta dahi Füzuliyə, Xətaiyə sataşanlar, söz atanlar var. Görün adını çəkdiyim şəxsiyyətlər sağlıqlarında sapı özümüzdən olan baltalardan nələr çəkiblər.

"Əkinçi" kimi bir qəzetin naşiri, mətbuatımızın peyğəmbəri səviyyəsinə yüksələn Zərdabi gör özü haqda nə deyir:

"- Mirzə, bilsəz məndən hökumətə nə qədər danos yazırlar. Özü də ən çox canfəşanlıq edən özümüzünkülərdi. Məni seçkilərdə də qaraladılar. Öz müsəlmanlarımız pozdu, o yerə xaricilərdən birini intixah elədilər." Bəli, budur böyüklərin, dahilərin, seçilmişlərin taleyi. Ariflərdən ürək, ağıl mükafatı, nadanlardan, naqislərdən pislik, şər-böhtan yemək, dedi-qodu pəncəsində çırpınmaq.

Ancaq dedi-qodular, naqisliklər, paxıllıqlar, şər-böhtanlar suda qar əriyən kimi əriyib gedir. Qalan halal yaradıcılıq, halal zəhmətin yaratdığı milli və bəşəri sərvət kimi yaşayan kitablar, qiymətli əsərlər, deyilən sözlər, yazılan fikirlər olur. Gedən küləkdi, qalan qayadı, gedən dumandı, qalan dağdı, itən, yox olan köpükdü, axan çaydı.

Dünyada zirvələr, ucalıqlar, yüksəkliklər, ucalanlar, ucaldanlar yaşayır. Siz də o zirvələrdən biri kimi, "Əsrin əsiri" kimi, ədəbiyyatımızın fədaisi, xalqın oğlu kimi həmişə yaşayacaqsınız. Sizə uğurlar olsun, Anar müəllim!



**Həsən MİRZƏ**
**Əməkdar elm xadimi, professor**

# MƏŞHUR AŞIQLARIN VƏ ŞAİRLƏRİN SALSAL QALASI VƏ SALSAL TOPONİMİNİ NƏZMƏ ÇƏKMƏSİ

Salsal Dərələyəzdə çox qədim, əzəmətli və məşhur bir qalanın adıdır. Bu qala Keşkənd (Yeğeqnadzor) rayonunda Ələyəz, Hosdun, Həsənkənd, Erdərin, Horbadıq adlı kəndlərin əhatəsində, uca bir qayanın başında tikilmişdir. Strateji cəhətdən çox əhəmiyyətli yerdə tikilmiş bu qalanın içindən rayondakı kəndlərin, yolların, keçidlərin, aşırımların, gediş-gəliş cığırlarının əksəriyyətini nəzərdə saxlamaq, hücumların qarşısını almaq mümkündür.

Qala çox uca və sıldırım qayanın başında tikildiyi üçün ona üç tərəfdən çıxmaq çox çətindir. Qalanın iki qapısı vardır. Əsas yolu isə şərq tərəfdəki (Ələyəz kəndi tərəfdəki) yalın üstündədir. İkinci qapısı isə Erdərin və Horbalıq kəndləri tərəfdəndir. Bu, əsas qapıya nisbətən bir qədər balacadır. Bundan başqa, qalanın qərb (günbatan) tərəfində, Hosdun və Həsəndkənd səmtində divarın özülündə çıxış üçün gizli bir kiçik qapı da vardır ki, bu, daş ilə hörülmüşdür. Bu qapını yalnız qalanın içindən açmaq olar. Bunun üçün həmin daşı qalanın içindən bayır tərəfə itələməlisən. Bu daşın eni təxminən 60 sm, uzunluğu isə bir metrdir.

Qeyd etməliyəm ki, Salsal qalasının sahəsi çox böyükdür. Uzunluğu enindən çoxdur. O, bir neçə hektar sahəni əhatə edir. Qalanın şimal və cənub tərəfində xeyli miqdarda, təxminən 3m x 4m ölçüdə xeyli yaşayış yerlərinin (otaqların) qalıqları da vardır. Qalanın ortasında isə sahəsi 25-30 $m^2$ həcmində bir nəzarətçi otağı, təqribən 10-15m hündürlükdə olan nəzarətçi yeri vardır ki, bu qüllənin daşdan olan qalıqları indi də qalmaqdadır.

Qalanın yonulmuş iri daşlardan hörülən divarlarının eni 2-3m, ucalığı isə 3-5 metr olar. Qaladan ətrafı müşahidə etmək və düşmənə atəş açmaq üçün divarların yuxarılarında xırda-xırda pəncərələr (taxçalar) qoyulmuş və adamların boyu həmin yerə çatsın deyə divarın dibində ayaqaltı daşlar hörülmüşdür.



***Dərələyəz, Salsal qalası***

Qala sıldırım qayanın başında tikildiyindən orada su yoxdur. Buraya təxminən 4-5 km məsafədən (Qarabulaqdan Qoşavəngə gətirilən sudan) gizli yollarla su çəkilmişdir. 4-5 düymə diametri olan saxsı tinglər (borular) təxminən bir metr dərinliyində yerə basdırılmış və həmin tinglər vasitəsilə qalaya su aparılmışdır.

Mən 1955-ci ildə Salsal qalasına çıxanda həmin saxsı tingləri öz gözümlə görmüşəm. Ələyəz kəndindən dağ yolu ilə Horbadıq kəndinə gedəndə yolda "Kötürkə" adlanan yerdə sel yeri eşib xəndək eləmiş və həmin saxsı tinglər üzə çıxmışdı. Salsal qalasını və ora saxsıdan çəkilmiş su tinglərini Dərələyəz camaatının çoxu görmüşdür.

Belə bir rəvayət söyləyirlər ki, "qalanın məğlubedilməzliyini hiss edən düşmən bir qatırı bir həftə qaranlıq yerdə su vermədən saxlayır və yemləyir. Sudan korluq çəkən qatırın gözlərini bağlayaraq qalanın qapısı tərəfə aparırlar. Qatır xeyli gəzəndən sonra torpağı dırnağı ilə eşməyə başlayır. Həmin yeri qazırlar, qalaya gedən su kəmərini tapıb kəsirlər. Sudan korluq çəkən qoşun əhlinin bir hissəsi gizli yolla qalanı tərk edir, bir hissəsi isə təslim olmaq məcburiyyətində qalır".



*Dərələyəz, Salsal qalası*

1905-1907, 1918-1919-cu illərdə erməni-müsəlman davalarında Salsal qalasını əldə saxlamaq üçün çoxlu döyüşlər getmiş və qala əksər vaxtı azərbaycanlıların əlində olmuşdur. Yaşlı adamların, erməni-müsəlman davalarının iştirakçıları və şahidlərin söylədiklərindən məlum olur ki, 1905-1907, 1918-1919-cu illərdə Salsal qalası üstündə gedən döyüşlərdə və qaladan erməniləri çıxaran vaxtlarda Gülüdüzlü Şahbazoğlu Calal, Horbadıqlı Haceyvaz, Nəbilərli Hüseynqulu oğlu Əli, Hostunlu Məşədməmmədxan, Canılı Usta Mehdi, Calalbəy, Məşəd İmran, Cabbar, Ərğzəli Mirsəqulu, Qabaxlı Ovçu Qəhrəman, Gendərəli Əsəd və oğlu Həsən, Ələyəzli Qaçaq Talıb, Qalaserli Hacəsədoğlu Əli, Qaraqayalı Qaçaq Süleyman, Qovuşuqlu Hacnamzlı oğlu Əmir, Hümbətalı oğlu Abbas, Nurməmmədoğlu Əli, Fərzalı oğlu Sarı Musa, Mirzəlioğlu İbrahim, Baxşalı oğlu Cabbar, Güneyvəngli Fatan oğlu Şirin, Ayısəsikli qaçaq Pesərək, Gədikvəngli Katda Əli, Horslu Aşıq Qəhrəman və bir çoxları xüsusi qəhrəmanlıq göstərmiş, "Ya Əli" nərəsi çəkə-çəkə ölümün üstünə düz gedərək erməniləri qaladan çıxarmışlar. Deyilənlərə görə Cul kəndindən Aşıq Həşin, Qaçaq Ağa, Qangöz İsmixan, Qaravəngdən Qaçaq Bağır, İsti Sudan Səfo oğlu Alı, Çivədən Vəkilov Balabəy, Ağkənddən Yunis adamxor Xaçonu öldürən və başqaları bu çətin anda öz dəstələri ilə köməyə gəlmişlər.

Oxucuların nəzərinə çatdırım ki, Dərələyəzə yaxından bələd olan aşıqlar, şairlər və şair təbiətli adamlar öz qoşmalarında əzəmətli Salsal qalası və Salsal adlı qəhrəman haqqında yaddaşlarda yaşayan tarixi həqiqətləri, ərəblərlə burada gedən döyüşləri, İmam Əli ilə bağlı rəvayətləri, bu və ya başqa şəkildə nəzmə çəkmişlər. Biz burada onlardan bəzilərini qeyd etməklə kifayətlənəcəyik.

*Əzizinəm Sal-Sala,*
*Bu yol gedir Salsala.*
*Qəvi düşmən güc gəlsə,*
*Sığınaram Salsala.*

### *SALSAL QALASI*

*Şahı-mərdan yazılıbdı daşında,*
*Düldülün izi var qala qaşında.*
*Yetmiş nərdivandı göyün ərşində,*
*Sırat körpüsüdür Salsal qalası.*

*Salsal qala tarixlərə bəllidi,*
*İgidləri gümüşxəncər bellidi.*
*Bənd-bərəsi mindi, yüzdü, əllidi,*
*Elin tilsimidi Salsal qalası.*

*Divarı da daşdı, qapısı da daş,*
*Daşlar səf-səf durub bir-birə sirdaş.*
*Qılınc çəkən ərlər bir-birə qardaş,*
*Qalalarda başdır Salsal qalası.*

*Ting ilə çəkilib Səlsəlbil suyu,*
*Əlli min arşındır tinginin boyu.*
*Bu yerdə ərlərin oğuzdur soyu,*
*Türkün məskənidir Salsal qalası.*

*Alı deyər, gəldim toya-düyünə,*
*Nər igidlər məni görə söyünə.*
*Nağaralar gumbul-gumbul döyünə,*
*Koroğlu səngidi Salsal qalası.*

(Aşıq Ələsgərin ustadı Aşıq Alı)

***

*Dünyaya tək gəlmişəm, Dal-İbni-Dal kimi,*
*Aləmə adım düşüb ol Rüstəmi-Zal kimi.*
*Sözdən qala yapmışam, Qəleyi-Salsal kimi,*
*Əridib saf etmişəm Qümrüyə misal kimi,*
*Oxumuşam min bir dili, çox da firəngəm, sənə nə?*

(Şəmkirli Aşıq Hüseyn, Azərbaycan aşıqları və el şairləri, I cild, Bakı, 1983, s.326)

***

*Ya Əli, ismin qurbanı sənsən Qəzənfər ağa,*
*Həm Əlisən, həm Valisən, vəsfi-peyğəmbər ağa.*
*Babi-nüsrət, Xafi-küfrət, qayili-Əntər ağa,*
*Şəhri Zərdə Salsal qorxdu Zülfüqardan ya Əli.*

(Bəhmən Göyçəli, Vətən, küsmə məndən, Bakı, 1994, səh.74-75)

***

*Yəqin kəsər zəhri zəhrin salsalı,*
*Qəza cana həzrin zəhri salsalı.*

*Aşıq gəzər Salsalı,*
*Yar qəddini sal salı.*
*Canan canı nəzərdən,*
*Əyər yaxşı sal salı.*

*İçində qardaşı zəhrin salsalı,*
*Səsləndi dilində dil əyər-əyər.*

(Göyçəli Aşıq Musa. Azərbaycan aşıqları və el şairləri, I cild, Bakı, 1983, s.346)

***

*Gəlsin Nuh peyğəmbər, tərpənsin Salsal,*
*Ağrın alım, ay Kamandar, "Misri" çal.*

(Aşıq Əsədin yubileyində oxunan qoşmadan, 12.10.1994, saat 22:00)

***

*Salsalın qalası məğrur, vüqarlı,*
*Qoçdaşlı qəbirlər sinəsi dağlı.*
*Alban kilsələri sirli, soraqlı,*
*Salıb tarixə iz Dərələyəzdə.*

(Həsən Mirzə)

***

*Hostundan çıx gəzə-gəzə,*
*Salsaldan keç Ələyəzə.*
*Aşıq Hüseyn süzə-süzə,*
*Sədəfli saz çalanda gəl.*

(Qara Həsən Dərələyəzli)

***

*Salsalın qalası, Əlinin daşı,*
*Sinəmə tökülür gözümün yaşı.*
*Atamın, anamın o məzar daşı,*
*Yadıma düşəndə vətən, ağlaram.*

(Narıngül Dərələyəzli)

Yuxarıda verilmiş qoşmalardan görünür ki, Salsal həm qala, həm də məşhur sərkərdə adıdır. “Aşıq gəzər Salsalı”, “Sözdən qala yapmışam, qəleyi-Salsal kimi”, “Salsalın qalası məğrur, vüqarlı”, “Salsaldan keç Ələyəzə”, “Salsalın qalası, Əlinin daşı”, “Bu yol gedir Salsala” kimi beytlərdə Salsal sözü qala mənasında verilmişdir. “Şəhri Zərdə Salsal qorxdu Zülfüqardan, ya Əli”, “Gəlsin Nuh peyğəmbər, tərpənsin Salsal” beytlərində isə Salsal sözü şəxs adı, cəngavər döyüşçü mənasında işlənmişdir.

Burada maraqlı, gələcəkdə tədqiq olunması çox zəruri olan bir məsələ meydana çıxır. Qədim tarixi, şəriəti və bunlarla bağlı hədis və rəvayətləri yaxşı bilən Aşıq Bəhmən Göyçəli “Şəhri Zərdə Salsal qorxdu Zülfüqardan, ya Əli” deyərkən o “Zər” şəhəri hardadır? Görəsən, Dərələyəzdəki Salsal qalasının şimal-qərb ətəyində yerləşən, erməni ensiklopediyasının X cildində Baqratilərin mərkəzi hesab olunan, indiki Erdəpin kəndinin yerində olan qədim şəhərin “Elgiz” – Eloğuz-Oğuzeli şəhərinin “Zər” ilə əlaqəsi necədir? Görəsən Aşıq Bəhmən bu qalanın cənubi-şərq

ətəyindəki Hosdun və Ələyəz kəndləri arasında, uzunluğu 4 km olan, Dəmirtəpə dağından gələn vulkan və digər səbəblər nəticəsində xarabazara çevrilən qədim şəhəri nəzərdə tutmur ki?

Belə bir fakt qeyd edilməlidir ki, Göyçədə “Zərzəbil”, “Zər”, Kəlbəcərdə “Zar”, Kotaykda (Qırxbulaq) “Zər” adlı kəndlər vardır. Hətta 1590-cı illərə aid mənbələrdə Göyçə “Zər nahiyəsi” adı altında verilir. Dərələyəzə həmsərhəd olan Göyçə və Kəlbəcərdə “Zar” və “Zər” adlı kəndlərin olmasını, Salsal qalasının Dərələyəzdə yerləşməsini, bu qalanın ətrafında qədim şəhər xarabalıqlarının mövcudluğunu, Dərələyəzdə qədim dövrlərə aid tarixi abidələrin çoxluğunu, ermənilərin Salsal qalasını öz adı ilə adlandırmamasını və sair bu kimi bir çox faktları nəzər alıb belə güman etmək olar ki, “Zar” şəhəri Dərələyəzdə və yaxud ona yaxın yerlərdə (Göyçədə və ya Kəlbəcərdə) olmuşdur.

Dərələyəzdəki Salsal qalası ilə bağlı başqa bir rəvayət də vardır. Narıngül Dərələyəzli Dərələyəzə həsr etdiyi qoşmasında “Salsalın qalası, Əlinin daşı” beytində həmin rəvayətə işarə edir.

Rəvayətə görə ərəblər bu yerlərə hücum edən vaxt (VII-IX əsrlərdə) Salsal bu qədim qalaya çəkilir və ərəblərin qoşununu 3-4 km irəli buraxır. Sonra da onları mühasirəyə alıb məhv edir. Nəticədə cənabi Əmir Əli onunla döyüşə girir və Əli Salsal qalasından böyük bir daş götürüb Salsala tərəf atır. Əlbəttə, burada şişirtmə vardır. Ələyəz kəndi ilə Hosdun kəndinin arasında, yolun qırağında olan daşın (Əli daşının) üstü beş barmaq yerini xatırladan forma almışdır. Bu da çox böyükdür. Bunu güclü texnika ilə də yerindən tərpətmək çətindir.

Nəticə olaraq deyim ki, Dərələyəzdəki Salsal qalası azərbaycanlıların qədim babalarına məxsus olmuş və onlar burada xarici istilaçılara və digər düşmənlərə qarşı döyüşmüşlər.

Maraqlı odur ki, Salsal ilə bağlı Azərbaycan torpaqlarının digər bölgələrində də rəvayətlər söylənilir. Qarakilsə (Kirovakan) rayonunun 75 yaşlı müəllimi, pedaqoji elmlər namizədi Yusif Qazıyev gənclik dövründə 100 yaşı olan babasından Salsal haqqında eşitdiyi rəvayəti 22 fevral 1992-ci ildə yazıb mənə verdi. Yusif müəllimin Salsal haqqında söylədiyi rəvayət belədir:

Salsal Azərbaycanda sülalə olub, sülalənin vəliəhdləri nəsildən-nəsilə Salsal adı ilə keçib. Son Salsal ərəblərlə döyüşlərdə həlak olub. Son Salsalın əsas müdafiə dayağı Göyəzən qalası olub. Rəvayətə görə, Göyəzən dağının dörd tərəfi yonulub, daşınıb, onun ətrafında şəhər salınıb. Qalanın ortasında 2 otaqdan ibarət ibadət ev olub. Uşaq vaxtı babam məni ora çıxarıb göstərmişdir. Evə girmək mümkün deyildir. Ora gərək kəndirlə sallana idik.

Qalanın başı düzənlikdir. Burada ərzaq və ordu yerləşərmiş. Hücumdan sonra ordu orada dincələrmiş və ehtiyat hissələri həmişə orda yerləşərmiş. Qalanın başında su quyusu var imiş.

Babam deyirdi ki, Salsal ərəblərlə mübarizə edərkən uzun müddət bu qalada məskən salmış və ərəblər qala ətrafı şəhəri tamamilə yerlə yeksan ediblərmiş. Bu zaman Salsal ən yaxşı döyüşçüləri ilə qalaya çəkilibmiş. O uzun müddət mühasirədə qalır, lakin sonra ərəblər onu tilsimə salıb yatdığı yerdə tuturlar. Salsal ayılanda deyir ki, buraya Məhəmmədin çığırğan Əlisindən başqa heç kim girə bilməzdi. Yəqin məni tutan odur. O, nərə çəkib döyüşə atılır və bu döyüşdə həlak olur. Onu əvəz edən arvadı Şaman qüvvələri səfərbər edib qalanı alır. O, bu qalada üç ay ərəblərə qarşı vuruşur. Lakin nəticədə məğlub olur.

Salsal sözünün həm qala, həm də şəxs adı kimi işlənməsinə gəldikdə deməliyəm ki, bunların hər ikisi də qədim tayfa (Sal tayfasının) adından götürülmüşdür. Türk dillərində belə faktlar çoxdur. Məsələn, Xəzər sözü həm dəniz, həm də şəxs adı kimi işlənir. Əslində xəzər sözü “Xəz və Kas” tayfa adının cəm formasıdır. Bu xəzlər, kaslar mənasındadır. Burada x-k, z-s dəyişməsi baş vermişdir. Deməli, Salsal sözü əvvəlcə tayfa adı olmuş, sonra da bu etnonim qala və şəxs adına verilmişdir.

Salsal sözünün tayfa adı olması şübhəsizdir. Dil faktları göstərir ki, lap qədim dövrlərdə etnonimlərin bir qismi qoşa şəkildə işlənmişdir. Türk dillərində, o cümlədən, Azərbaycan dilində olan Qarqar, Xarxar, Xalxal, Herher, Hərhər, Kərkər, Tərtər etnonimləri buna canlı sübutdur.

Başqa faktlar da vardır. Mahmud Kaşğari yazır ki, türk tayfalarından birinin adı Cikildir. Roza Eyvazova əlavə edir ki, Ciğil tayfa adı qədim türk dili abidələrində Cik-cik variantında qeydə alınmışdır. Kitabi-Dədə Qorqud dastanında da Qoşa işlənən toponim – “Bam-Bam” toponimi vardır.

Çox güman ki, yuxarıda göstərdiyimiz etnonimlərin Qoşa işlənməsi, eyni sözün təkrar olunması, hər şeydən əvvəl, cəmlik bildirməyə və mənanı qüvvətləndirməyə, bir növ dərəcə rolunu oynamağa xidmət etmişdir.

Qeyd etmək lazımdır ki, M.Baharlı 1920-ci ildə yazdığı coğrafiya kitabında və B.Budaqov özünün “Türk uluslarının yer yaddaşı” adlı əsərində Qarqar, Kərkər, Xalxal etnonimləri ilə yanaşı “Sorsor/Sursur” tayfa adını da çəkirlər. Ola bilsin ki, Sor-sor, Sur-sur etnonimi ilə Sal-sal etnonimi eyni yuvadan meydana gəlmişdir. Türk dillərində 1-r sonorları bir-birini əvəz etdiyi kimi (məs: zərər-zərəl), saitlər də bir-birini əvəz edə bilir.

Fikrimizcə, Salsal və Sal eyni tayfanın adıdır. Qiyasəddin Qeybullayevə görə "Sal" Hun mənşəli toponimdir. Sal etnotoponiminin arealı çox genişdir.

Bunu da deməliyik ki, Azərbaycan torpaqlarını öz adlarına çıxmaq istəyən və tarixi saxtalaşdıran erməni şovinistləri Salsal qalasını tədqiqatçıların diqqətindən yayındıra bilməyəcəklər. Cidanı çuvalda gizlətmək olmaz.

Salsal qalası ilə bağlı olan bir əhvalatı da gələcək tədqiqatçıların və nəsillərin diqqətinə çatdırmağı faydalı hesab edirəm.

1947-ci il yazın əvvəllərində Ələyəz kənd sakini Hacibad oğlu Məhəmməd (ucaboylu kişi idi) Salsal qalasına çiriş yığmağa gedir. O, görür ki, qala divarının özüllünə yaxın, sıldırım qayanın başında çoxlu çiriş var. İbad çətinliklə də olsa alpinist kimi həmin yerə çıxa bilir. İbad kişi həmin çirişləri yığanda görür ki, taxçaya oxşar bir yerdə, qarışqa yuvasının yanında daşın üstünə kağız qırıntıları tökülübdür. O, həmin yerə diqqətlə baxanda görür ki, taxçanın ağzındakı daş qayaya bitişməmiş, onu balaca (dəndənə ilə) qayaya bərkitmişlər. Buranın xəzinə olduğunu fikirləşib sevinir. Həmin daşı çıxaranda görür ki, burada çoxlu qədim kitablar və yazılar vardır. İbad kişi çirişi yerə töküb apardığı qablara həmin kitab və yazıları yığaraq evə gətirir. Evə gələrkən yolda Həsənkənddən olan iki erməni ilə rastlaşır və sadəlövhlük edib bu məsələni onlara danışır. Ermənilər bir söz deməyib gedirlər. İki gündən sonra onlar İbadın yanına gəlir və ona deyirlər ki, rayon bu məsələni eşidibdir. Bu məsələni sən hökumətə xəbər vermədiyinə görə səni tutacaqlar. Hər hansı qədim bir şeyi tapan şəxs dərhal onu hökumətə xəbər verməlidir. İndi sən bir neçə gecə evə gəlmə və həmin yazıları da ver aparaq biz saxlayaq. Ya adam tapıb oxudarıq, ya da gəlib apararsan. Sonra həmin adamlar bunu qorxudub, həmin qədim yazıları vermirlər.

Dərələyəzdə 100 yaşdan çox ömür sürən, Alxanpəyəsi kəndində doğulmuş ovçu, sonralar Ələyəz kəndində məskunlaşıb ömür sürən və orada dünyasını dəyişən Əhməd kişinin dedikləri: Bir gün – 1961-ci ilin sentyabr ayında Horsdan gəlirdim. Salsal qalasının tikildiyi dağın altı ilə kəklik vurmaq arzusu ilə gedirdim. Bir də gördüm ki, dağın başında, qala divarının özülündə bir nəfər işləyir. Elə bildim ki, kimsə qızıl axtarır. Salsal qalasına qalxdım. Qala divarının üstünə çıxdım. İşləyən adama diqqətlə baxdım. Əlində çəkic və zubil ilə daşların üzərində nə isə yazırdı. Bu adamdan şübhələndim və yəqin etdim ki, azərbaycanlı deyil. Bunu güddüm. Axşam oldu, həmin adam qala divarına iplə dırmaşıb çıxdı və ətrafa nəzər saldıqdan sonra düşüb Erdəpin kəndinə tərəf yollandı. O gedəndən sonra həmin yerə yaxınlaşdım. Gördüm ki, o

kəndirin bir ucunu qala divarın dibində yerə çalıb dəmir parçasına bağlamışdır. Kəndiri belimə bağlayıb qala divarının çöl üstünə düşdüm. Gördüm ki, həmin adam qala divarının özül daşlarına "xaç" çəkmiş və bura həkk etmişdir. Bu yazıları ərəb əlifbası ilə yazılmış daşların üzərinə yazmışdı. Mən əsəbiləşib həmin yazıları əlimdəki kiçik balta ilə qırıb pozdum.

Əhməd kişinin dediyinə görə qaladakı böyük daşların üstündə qoyun, keçi və at rəsmləri var idi.

Salsal qalası ətrafında baş verən iki məsələni də qeyd etmək yerinə düşər. Ələyəz kənd sakini ovçu Balacan bu yaxınlarda Bakıda mənə bir əhvalat danışdı. O söylədi ki, 60-cı illərdə mən Salsal qalasının altında, Ələyəzdə Hosdun kəndinin arasındakı daşlıqda kəklik ovuna getmişdim. Bir də gördüm ki, Salsal qalasının ətəyindəki balaca təpəlikdə iki erməni bir kövrək daşı yarırlar. Soruşanda cavab verdilər ki, ev tikirik, çənə daşı hazırlayıb aparırıq. Mən bir neçə vaxtdan sonra ordan keçəndə gördüm ki, daşı aparmayıblar. Lakin daşın içində üç balaca küpə yeri var. Sonra məlum oldu ki, onlar burdan qiymətli şeylər aparmışlar. Sonra mən ev tikəndə həmin daşları gətirib çənə daşı yerinə qoydum.

Buna oxşar bir vəziyyət Salsal qalasının cənub ətəyində də baş vermişdi. Hostun kəndi ilə Ələyəz kəndi arasında Sarıburun deyilən yerdə Erdəpin kəndindən milliyətcə erməni olan bir traktorçu şosse yolu genişləndirərkən, deyilənə görə bir küpə qızıl tapır. Bu vaxtdan o köçüb İrəvan şəhərinə gedir və həmişə kasıblıqda yaşayan həmin adam şəhərdə özünə böyük imarətlər tikdirir.

Qədim insan məskəni olan Dərələyəzdə belə hadisələr yez-tez baş verirdi.



## Aşıq Hüseyn BOZALQANLI



### GƏRƏKDİR

Şair olub şeir, dastan yazanın,
Ellərin qəlbində yeri gərəkdir.
İncidən, sədəfdən, ləli-gövhərdən,
Sərrafın dəstində zəri gərəkdir.

Ustaddan dərs alıb, səfa sürməyə,
Haqqı, ədaləti aşkar görməyə,
Arif məclisində cavab verməyə,
Sənətkara zəhmət təri gərəkdir.

Arzusu, diləyi həqiqət üçün,
Səmimiyyət üçün, sədaqət üçün,
Bəşəriyyət üçün, məhəbbət üçün,
Qüdrətdən ilhamı, şeiri gərəkdir.

Eşqin dəryasına dalan aşiqin,
Ürəklərdə məskən salan aşiqin,
Tarixlərdə izi qalan aşiqin,
Sinəsində söz dəftəri gərəkdir.

Aşıq Hüseyn qəlbi şad qoyub gedə,
Kəlməsi dəhanda dad qoyub gedə.
Öləndə dünyada ad qoyub gedə,
Qəbri əsrlərin piri gərəkdir.

### DÜNYADA

Qafil könlüm, aç gözünü , ayıq ol,
Qaranlıq qəflətdə yatma dünyada.
Hər bir zəmanənin bir tarixi var,
Məqamı gələndə ötmə dünyada.

Əyrilər işləməz düz bazarında,
Ariflər seçilər göz bazarında.
Gövhəri sərf eylə, öz bazarında,
Bazarı olmasa, satma dünyada.

Düşməninə xədəngini gözlə vur,
Mərd dostuna aç sirrini, gözlə vur.
Şikarını bərəsində gözlə, vur,
Əfsanə oxunu atma dünyada.

Mərd igid dostuyla düz ülfət eylər,
Günbəgün artırar, məhəbbət eylər.
Müxənnət həmişə xəyanət eylər,
Namərdlə ülfətin qatma dünyada.

Qeybətə uyuban süxənkar olma,
Dosta yalan satıb günahkar olma.
Şeytanın qövlünə tərəfdar olma,
Günaha, bavala batma dünyada.

Hüseyn, gedişatdan olma bixəbər,
Həqiqəti müdam söylə sərasər.
Sabir tək səy ilə cəm eylə dəftər,
Ayrı bir iş, peşə tutma dünyada.

**ÇƏKMƏSİN**

Hər cəfənglər saz götürüb, söz deyib,
Şairlik ismini sana çəkməsin.
Çibin, milçək zənbur kimi sızlayar,
Qanqalın şəhdini şana çəkməsin.

Şairlik elmində pürkamal gərək,
Divani, təcnisi hər misal gərək.
Kotana qoşmağa kəltə kəl gərək,
Kələ qabaq körpə dana çəkməsin.

Eşqin kürəsində bişib, yanmayan,
Qafiyəsin, qələtini qanmayan,
Bədöy bəsləyibən köhlən minməyən,
Ulağını bu meydana çəkməsin.

Ustadlar kəlamı bizə gələndə,
Xəstə cismim olur təzə, gələndə.
Arif mclisində üzə gələndə,
Onda yaxasını yana çəkməsin.

Lənət müxənnətə, ara qatana!
İnsan gərək yalan sözdən utana.
Xəbər verin, sınıq saxsı satana,
Cürdəyini hər sindana çəkməsin.

Qovğaya düşübdü, bu yazıq Hüseyn,
Nə məndə can qaldı, nə də baş, beyin.
Tülkü dərələrdə aslana boyun,
Hünərini qana-qana çəkməsin.

**YAXŞIDI**

Əzəl bir adamla dostluq eyləsən,
Onu çəksən imtahana, yaxşıdı.
Baxdın, gördün, ilqarına kəc oldu,
Ona tapsan bir bəhanə, yaxşıdı.

Hər kimsə ki, olsa nütfədən halal,
Şirin ləhcə, xoş sədaqət, düz xəyal,
Anlaqlı, həm mərifətli, pürkamal,
Kimdə olsa bu nişanə, yaxşıdı.

Hüseynin sözləri aşikar olar,
Qanana nəsihət yadigar olar.
Çox gülüb danışan biilqar olar,
Əhdə ilqar hər insana yaxşıdı.

**YAXŞI AD**

Səyyad olub ov bərəsin kəsəndə,
Yaxşı yerdə yaxşı gözlə, yaxşı yat.
Ovun gəlib bərəsinə çatanda,
Sərvaxt dayan, dürüst tuşla, yaxşı at.

Bekar arvad cavan əri qocaldar,
Əsil olsa, çox dərdini azaldar.
Üç şey deyim, insan başın ucaldar,
Yaxşı səxa, yaxşı sürfə, yaxşı ad.

Arsız qohum xalqı sənə güldürər,
Pis qardaşın dərdi adam öldürər.
Hüseyn deyər, yıxılsan da qaldırar,
İgid düşmən, ilqarlı dost, yaxşı yad.

**YAXŞI SAT**

Mərd igidi üç şey çəkər qabağa,
Yaxşı yoldaş, yaxşı sirdaş, yaxşı ad.
Bir ayə var, min ayədən əfzəldir,
"Be"ydi, "hey"di, yaxşı "lam"dı,
yaxşı "sad".

Bədöy mənzilinə hər at yetirməz.
Nanəcibə öyüd versən, götürməz.
Ölənədək nişanını itirməz,
Yaxşı əsil, yaxşı nəsil, yaxşı zat.

Hüseyn sözün nə gizləyə, nə dana,
Nə yaranar, daha doğar nə də ana.
Gövhər mətahını açma nadana,
Tök bazara, sərrafına yaxşı sat.

**DANIŞMA**

Yön çevirib bir məclisə varanda,
Ağır otur, sağa-sola danışma.
Hərcayı söyləmə, pis adamlar tək,
Laf edibən gülə-gülə danışma.

Sözün tutma hər azğının, axmağın,
Xoşlanılmaz aralıqdan çıxmağın.
Layiq deyil başa qaxınc qaxmağın,
Öz eybini bilə-bilə danışma.

İnsan gərək hər məclisdə sayılsın,
Həqiqətdən danış, "Əhsən!" – deyilsin.
Kəlmə çıxart, şirin cana yayılsın,
Aşırıb sözünü zilə, danışma.

Hər gizli sözünü söylə qanana,
Aşiq olma şər-böhtana, yalana.
Sirrin vermə hər üzünə gülənə,
Tez düşəcək dildən-dilə, danışma.

Yazıq Hüseyn, əhdin yetər yerinə,
Çək sözünü şəriətə, dərinə.
Satginan mətahın xiridarına,
Hər söz anlamaza, mala danışma.

**OLACAQDIR**

Könül, talib olub uyma şeytana,
Fitnə, şəmatəsi şər olacaqdır.
Bu dünya bir bağdı, bağbanı iblis,
Alması, heyvası, nar olacaqdır.

Gözəllər təşbehdi bağın gülünə,
Mail olma şirin ləhcə, dilinə.
Həvəslənib sığal vermə telinə,
Məhşərdə hər muyun mar olacaqdır.

Aldanma cifəyə, uyma fənaya,
Güvənmə dövlətə, simü-tilaya.
Bir gün apararlar dari-uqbaya,
Simu-zərdən əlin car olacaqdır.

Əməl bir parçadı, mələklər dərzi,
Dərk eylə vacibi, sünnəti, fərzi.
Nəkrail hayxırıb, çalanda gürzü,
Rövşən gözün tiri-tar olacaqdır.

Nütvədən pak olan siratdan keçər,
Müxənnət münkiri almazlar biçər.
Səxavət əhlini mələklər seçər,
Kövsəri-rizvandan yer olacaqdır.

Alma həqqünnasdı, tamı şirindi,
Heyva ribadı, qandı, irindi.
Nar səğir malıdı, hədsi dərindi,
Dənəsi cəsəddə nar olacaqdır.

Hüseyn, zaiğətül-mövtü yazanda,
Şərm eylə, sal yada fəhmin azanda.
Gün hərarət edib, yerlər qızanda,
Şahi-mərdan şəfakar olacaqdır.

**GÖRMÜŞƏM**

Bu qoca dünyanın yoxdur vəfası,
Gah boşalıb, gah da dolan görmüşəm.
Qızılgül açılıb heç xəndan olmaz,
Xəzan dəyib, birdən solan görmüşəm.

Cahanın gülünü bir kimsə dərməz,
Qəza kəməndinə düşən qurtarmaz.
Bəndə yüz çalışsa, biri düzəlməz,
Haqdan qeyrisini yalan görmüşəm.

Yazıq Hüseyn Haqqa verib guşunu,
Qəza vurub, qədər əyib işini.
İtirənlər düzə bilmir beşini,
Milyonlar dağılıb, talan görmüşəm.

**Aşıq Şəmşir – 120**



**İsmayıl MƏMMƏDLİ**
**professor**

# AŞIQ ŞƏMŞİRİN DİL SƏNƏTKARLIĞI

Aşıq sənətinin tarixi Azərbaycan xalqının tarixi qədər qədimdir, bu sənət ellərimizlə birgə yaranıb bu günümüzə gəlib çatmışdır. Xalqın ruhu, xalqın dili və mənəviyyatı onda ifadə olunub, aşıq sənəti bu ruhu uzun əsrlər boyu yaşatmış, bu gün də yaşatmaqdadır. Qurbani, Miskin Abdal, Abbas Tufarqanlı, Sarı Aşıq, Xəstə Qasım, Aşıq Valeh, Ağ Aşıq, Aşıq Alı, Aşıq Ələsgər, Məmmədhüseyn, Zodlu Abdulla, Aşıq Musa, Aşıq Vəli, Şəmkirli Aşıq Hüseyn, Aşıq Hüseyn Bozalqanlı, Qaraqoyunlu Aşıq Əsəd, Aşıq Nəcəf, Növrəs İman, Mirzə Bilal və başqaları bu sənəti yaşadan ünlü klassiklərimizdir. Belə azman aşıqlarımızdan biri də Göyçə aşıq mühitinin davamı olan Kəlbəcər məktəbinin ləyaqətli nümayəndəsi, şair Ağdabanlı Qurbanın övladı Aşıq Şəmşirdir. Bu il – 2013-cü ildə onun anadan olmasının 120 ili tamam olur.

Aşıq Şəmşir sazın-sözün beşiyi olan Kəlbəcərin Dəmirçidam obasında dünyaya göz açıb. Onun əsərlərinin yaranma tarixinə-xronologiyasına nəzər salsaq, XX yüzilin əvvəllərindən başlayaraq 70 ilə yaxın söz qoşub-saz çalması həqiqətini qəbul edərik. İlk qələm təcrübələrindən görünür ki, aşıq öz dövrünün oğlu kimi, o dövrdəki Azərbaycanda olan ictimai bərabərsizliyə, sosial ədalətsizliyə, xeyirin öz yerində olmamasına, haqqın nahaqqa qurban verilməsinə dözməmiş, bu mövzularda şeirlər yazmışdır. Aşıq Şəmşir hələ gəncliyindən çəkinmədən öz mövqeyini ifadə edən öz məsləki-əqidəsi olan bir sənətkar kimi el içində tanınmışdır. Ustad aşıq öz sənətkar qələmini aşıq şeirinin qoşma, gəraylı, təcnis, müxəmməs, divani, ustadnamə, deyişmə və b. janrlarında sınamış, xalqın həyatı, məişəti, arzu və istəkləri ona zəngin mövzular vermiş və qızıl qiymətində olan ədəbi irsini – bədii üslub, bədii dil cəhətdən poetik

nümunələr yaratmışdır. Şəmşir sənətini birinci növbədə Azərbaycan xalqı dəyərləndirmiş, keçirdiyi toy-düyünlərdə, ağır yığnaqlarda onu dinləmiş, bu məclislər aşığa meydan olmuş, o, özünü sınaqdan çıxarıb məşhurlaşmışdır. Folklorşünas alimlər onunla görüşmüş, aşıqlıq sənətini rövnəqləndirən bilgiləri ondan



toplamış, toplu və məcmulərə daxil etmişlər. Amma bununla yanaşı onu əvvəllər də qiyabi tanıyan xalq şairi Səməd Vurğun aşıqla Kəlbəcərdə – İstisuda görüşməklə bu dahi ustadı kəşf etmiş, onların görüşü, tarixi deyişməsi bütün ölkəyə səs salmışdı. M.H.Təhmasib, V.Vəliyev, O.Sarıvəlli, S.Pirsultanlı, M.Həkimov, Z.Yaqub, M.Aslan, H.Kürdoğlu, Q.Namazov, M.Qaısmlı və başqa saz-söz biliciləri ustadın sənət dünyası barədə qiymətli fikirlər söyləmiş, onun yaradıcılığının bədii cəhətdən çox kamil və dərin xüsusiyyətləri ilə seçilməsi qənaətinə gəlmişlər. Biz də öz növbəmizdə vurğulamaq istərdik ki, ana dilimizin, onun ədəbi-bədii dilinin-üslubunun püxtələşməsində, cilalanmasında, zənginləşməsində Aşıq Şəmşirin məxsusi mövqeyi, xidməti olmuşdur. Biz həm də o fikirdəyik ki, aşıq-şairin bədii irsi yalnız bu günlərimizdə deyil, gələcəkdə də örnək olacaq, gələcək nəsillərə əmanət kimi ötürüləcək, neçə-neçə nəsilləri mənən zənginləşdirəcək, maarifləndirəcək.

Mən istərdim ki, 60-70 il öncəyə qayıdım. O dövrə ki, Nizami adına Ədəbiyyat İnstitutunda şərəfli bir vəzifəni yerinə yetirən Şifahi xalq ədəbiyyatı şöbəsi çox dəyərli işlər görürdü. Professorlar Məmmədhüseyn Təhmasib və Mirəli Seyidov, folklorşünas alimlər Əhliman Axundov, Nurəddin Seyidov, Həsən Qasımov (Allah onlara rəhmət eləsin) və başqaları xalq ədəbiyyatını ayrı-ayrı bölgələrə ekspedisiyalar yolu ilə topladıqları kimi, el aşıq və şairlərini də Akademiyaya dəvət edərək onlardan dəyərli folklor nümunələrini, əlyazmalarını toplayır, görüşlər keçirir, sorğular aparırdılar, konsertlər təşkil olunurdu. Bu dəvətlilər içərisində ən çox arzu olunan aşıqlar sırasında Aşıq Şəmşir həmişə aparıcı bir şəxsiyyət kimi qəbul olunardı, maraqlı görüşlər alınardı, xalq və aşıq dastanları ondan yazıya alınardı, həm də onun öz şeirləri də tarixin yadda-

şına salınardı. Əlbəttə, həmin anlar çox unudulmaz günlər idi. Bunları söyləməmək olmaz, unutmaq günahdır. Yenə də vurğulayıram ki, məhz həmin illərdə Azərbaycanda artıq məşhur olan Aşıq Şəmşir dəfələrlə bu mötəbər şöbəyə çağırılmış, onun fitri istedadı, qibtəolunacaq yaddaşı, dərin biliyi, öz orijinallığı ilə seçilən qoşquları – şeirləri bütün folklorşünaslar tərəfindən heyranlıqla qarşılanmış, onlara yüksək dəyər verilmişdir. Həmin görüşləri əks etdirən xatirə şəkilləri çəkilmişdir ki, bunlar bu gün çox qiymətli və unudulmaz tarixi yadigarlardır.

Mən bu haşiyədən sonra aşıq Şəmşirin şeirlərinin dili məsələsi üzərində fikirlərimi cəmləşdirmək istərdim. Onun əsərlərinin dilindən, üslubundan danışmazdan öncə bəzi məqamlara toxunmağı lazım bilirəm. Sənətkar ustad aşıqlar bir tərəfdən təmsil etdikləri xalqın dilinin qanını, canını ifadə etmək, bəyan etmək iqtidarında olurlar. Xalq məişətini, ellərimizin qədim və zəngin etnoqrafiyasını dərindən bilməsələr, çətin ki, onlar ustadlıq zirvəsinə də yüksələ bilərdilər. Bunlara aşıq Şəmşir hələ ilk qələm təcrübəsindən yiyələnməyə nail oldu və mahir sənətkar kimi tanındı, qəbul olundu. Xalqı tanımaq, dərk etmək, ondan öyrənmək, el-obanın sevincini, dərdini, arzusunu bütün varlığı ilə, doğru-dürüstlüyü ilə, real şəkildə yaradıcılığında əks etdirmək aşıq Şəmşirə də müyəssər olan xoşbəxtlik sayılmalıdır.

Sənətkar müxtəlif janrlı əsərlərində ana dilimizin, xalq dilinin lüğət xəzinəsinin dürlü-dürlü söz qatlarına enməyi bacarmış, bunlardan ustalıqla faydalanmışdır. Aşığın seçib işlətdiyi sözlər, deyimlər daha çox xalqımızın məişəti, həyat tərzi, adət-ənənələri, gündəlik həyati zərurət və tələbatı ilə bağlı, ellərimizin ən dəyərli sözləridir, peşə-sənət və fəaliyyəti ilə əlaqədar milli frazeoloji birləşmələrdir: ustadın qoşmalarından bir bəndi xatırlayaq:

*Bülbüləm, bağımda gül sevir məni,*
*Arif olan əhli-dil sevir məni,*
*Mən eli sevirəm, el sevir məni,*
*Şəmşir kimi mehribana toxunma!*

Bu bəndlə bağlı aşığın düşüncələrini öz sözləri ilə açıqlamaq daha doğru olardı. O deyir: «Toy-düyünümüzün uzun zaman ərzində susmaz bülbülü oldum. Sizinlə kamala çatdım. Sözdən dünyama hopanları ürəyimə bələyib yenidən sizə qaytarmaq oldu ömürlük vərdişim. Bir vaxt duydum ki, bütünlüklə sizə dönmüşəm! Özümü sizdə tapdığıma arxayın olub, əbədiyyət köçünün arxasınca gözünüzdən nihan olmuşam». Aşıq bu müraciəti, etirafı Rəbbimizə söyləyir. Arif olanlardan birincisini ulu Tan-

rını, rəbbimizi sanır. Təsadüfi deyil ki, Aşıq Şəmşirin şeirlərində «Rəbbimiz», «nuri-təcəlla», «ləmyəzəl», «faqi-bar», «Xaliqi-ləmyəzil», «Rəsulu Əkrəm», «Əhmədi-Muxtar», «Heydəri-Kərrar», «Şahi-Mərdan», «Xəlilullah», «rəhi-nüsrət», «Kəbə» və başqa onlarla ilahi dərgahla bağlı sözlərin, ifadələrin, dini müqəddəslərin adlarının işlənməsi olduqca təbiidir.

Aşıq Şəmşir Azərbaycanın elə bir dilbər guşəsində boya-başa çatıb, ömür sürüb ki, onun şeirlərində Kəlbəcər mahalının başıdumanlı, ağçalmalı dağları, dişgöynədən bulaqları, xalı mislində olan yaylaqları, çəmənzarları, tanrının xoş saatında yaranmış bu torpağın gülləri, çeşidli çiçəkləri, ən əsaslısı isə genişqəlbli, safürəkli, xoşdiləkli saf insanları onun şah misralarının bəzəyi olmuşdur.

Aşığın şeirlərində **lalə, laləzar, çəmənzar, nərgiz, bənövşə, yasəmənli quzeyin moruğu, döş çiyələyi, çəmən, çiçək, gül-çiçək, zanbaq, kəkliklər, sonalar, bülbüllər, durnalar** təbiətin cansız və sanlı möcüzələri bədii mətnə xüsusi təravət, təbiilik gətirir.

Sənətkarın şeirlərinin dilini diqqətlə nəzərdən keçirəndə bu dildəki zənginlik, axıcılıq, məna-rəngarəngliyi, intonasiya çalarları, xalq ruhunun əzəməti (və həm də doğmalığı, mərhəmliyi) istər-istəməz adamı ovsunlayır, sehirləyir. Aşığın xalq dilinin dərinliklərinə varması, söz seçimi heyrət doğurur. Bir neçə nümunə gətirmək yerinə düşərdi:

*Lalədi, nərgizdi evim-eşiyim,*
*Köynəyim sıx meşə, qoymaz üşüyüm,*
*Qərənfildi, qızılgüldü beşiyim;*
*Buz bulaqlı, göy yaylaqlar oğluyam.*

*Cavahirdir Azərbaycan torpağı,*
*Qızıl, gümüş hər sərvətin yatağı,*
*Uca zirvələrin – lalə bayrağı,*
*Şəmşirəm, nə gözəl diyar oğluyam.*

Daha bir bədii parça:

*Ov keçdi bərədən, uyquda yatdım,*
*Ayıldım, xədəngi izinə atdım.*
*Ha yüyürdüm, nə yetişdim, nə çatdım…*
*Hər işin qaydına qal vədəsində.*

*Söylə, gözəl, sən nə mətləb istəsən?*
*Nədən durdun aşiqinlə qəsdə sən?!*

*Axtarıb Şəmşiri görmək istəsən:*
*Doğru-düz ilqara gəl vədəsində.*

Birinci qoşmadakı bəndlərdə tərənnüm, vəsf aparıcıdırsa, sonrakı «Vədəsində» şeirindən ustad aşığın, müdrik, zəngin həyat təcrübəsi olan ağsaqqalın hikmətli nəsihətini oxuyuruq.

Azman sənətkarlar, mütəfəkkir alimlər də göstərmişlər ki, bədii dilin, obrazlı bədii dilin mahir yaradıcısı xalqdır, xalq arasında yetişmiş el şairləri və ustad aşıqlardır. Bədii dilin, üslubun ən gözəl nümunələrini daha çox aşıq yaradıcılığında, aşıq şeirində görmək olar. Bu mənada Aşıq Şəmşir irsi də diqqətəlayiqdir:

*Gəzirəm obanı-oymağı çoxdan,*
*Ellərin dilinin əzbəriyəm mən.*
*Dərin suallardan oldum xəbərdar –*
*Atan igidlərin səngəriyəm mən!*

*Xislətdə sadəyəm, eşqimdə Qafam!*
*Mən mürvət kanıyam, əhli-insanam!*
*Gövhəri tanıyan qoca sərrafam,*
*Seçilmiş covhərin zərgəriyəm mən!*

*Eşqi-məhəbbətin pərvanəsiyəm!*
*Bir alagözlünün divanəsiyəm!*
*Şəmşirəm, Qurbanın nişanəsiyəm,*
*Ustad aşıqların dəftəriyəm mən!...*

Aşıq «atan igidlərin səngəriyəm mən» deyərkən özünün mərd, yenilməz ərənlərə arxa olmasını nəzərdə tutur.

Sənətkar «eşqimdə Qafam» söyləyərkən sevgisinin Qaf dağı qədər uca və yenilməz olmasını göstərir. Aşığın bizə qoyub getdiyi irs, zəngin söz xəzinəsi onun sözün tam mənasında Ağdabanlı Qurbanın ləyaqətli nişanəsi olmasını təsdiqləyir. O da aşkarlanır ki, Aşıq Şəmşir özünəqədərki ustadların bizə ərməğan qoyduqları mənəvi sərvətlər onun şair – aşıq yaddaşındadır.

Dədə Şəmşirin

*Sirr açma namərdə, söz demə pisə,*
*Namərdin qəlbində söz dura bilməz.*
*Yoldaş olma alçaq olan nakəsə,*
*Danışar ilqardan, tez dura bilməz –*

misralarını dinləyərkən ustadlar ustadı Xəstə Qasım Tikmədaşlının həmişə təravətini, qiymətini saxlayan –

*Üz vermə nadana, sirr vermə pisə,*
*Axır qəlbin ya inciyə, ya küsə,*
*Ot bitər kök üstə, əsli nə isə*
*Yovşan bəsləməklə çəmənzar olmaz*

– öyüd-nəsihətini yada salırıq.

Öz zamanında və məqamında Tufarqanlı Abbasın söyləmiş olduğu bu günümüz üçün də qızıl qiymətində olan belə misraları var:

*Aşıq Abbas söylər sözün sərindən,*
*Arxı atın, suyu çıxsın dərindən*
*El bir olsa, dağ tərpənər yerindən,*
*Kənd bir olsa, zərbi zindan sındırar.*
(S.Mümtaz, El şairləri, B, 2005, s.23).

Biz Dədə Şəmşirin «Gedər» rədifli gəraylısında həmin hikmətli fikri yeni bir təqdimatda, yeni poetik bir formada görərkən sənətkarın istedadının qüdrətinə heyranlığımızı gizlədə bilmədik:

*Düzdü əhli-dilin sözü,*
*Şəmşir sevir, bilin, sözü.*
*Bir olarsa elin sözü,*
*Uca dağlar qopar gedər.*

Aşıq Abbasda «El bir olsa dağ tərpənər yerindən» fikri Aşıq Şəmşirdə «Bir olarsa elin sözü, uca dağlar qopar gedər» sözləri heç də ustadı təkrarlamır, ona başqa, yeni bir baxışdan məna verir.

Aşıq Şəmşir Dədə Ələsgəri özünə ustad hesab etmiş, onun söz sənətinə böyük ehtiramını bildirmişdir:

*Böyük tacidarım, kamil sənətkar,*
*Sənsən mənim pak ustadım, Ələsgər.*
*Yadımdan çıxarsa yazdığın əşar,*
*Qopar o gün qiyamətim, Ələsgər.*

*Ruhuma nur verən dahi sən oldun.*
*Sənətimin qibləgahı sən oldun.*

*İdrakımın mehri, mahı sən oldun,*
*Fikrim, zikrim, həm baratım Ələsgər.*

*Şəms olub düşübsən sən dildən-dilə,*
*Nəğmən pay verilib bağda bülbülə.*
*Xəzinə anbarın baqidir hələ,*
*Açılıb bazarın, satım, Ələsgər.*

*Sən mənə səadət, barat vermisən,*
*Şəmşirin qəlbinə qanad vermisən!*
*Zərrin irəxtili Qırat vermisən,*
*Durur o verdiyin atın, Ələsgər.*

Şəmşir «pak ustadı Ələsgər» sənətini qibləgahı, «idrakının mehri, mahı» adlandırır. «Şəms (günəş) olub düşübsən sən dildən-dilə» deyə vəsf etdiyi Dədə Ələsgəri «o şahım, ustadım Ələsgər» kimi qədirşünaslıqla yüksək dəyərləndirmiş, həm Ələsgərə, həm də özünə böyük hörmət qazandırmışdır.

Aşıq Şəmşir qəlblərin tərcümanı, insanların ruhu olan sözə böyük diqqətlə, həssaslıqla, hörmətlə yanaşmış və «Yaraşmaz» qoşmasında yazmışdır:

*Söz qızıldı qədirbilən insana,*
*Xilaf desən yaxşı dosta, yaraşmaz.*
*Saxta sözün axır çıxar yalanı,*
*Belə sifət sənə, usta, yaraşmaz.*

*Hədər söz insanı doğrayar, kəsər,*
*Hər nə söhbətin var, eylə müxtəsər.*
*Mən sənə nə yazım, eləsin əsər?!*
*Yaxşı da yaraşmaz, pis də yaraşmaz.*

*Xəbisi işindən olmaz ayırmaq,*
*Mahal işdi ac gözləri doyurmaq.*
*Hər tənqid deyənə xəncər şıyırmaq,*
*Düşmək Şəmşir ilə qəsdə – yaraşmaz.*

Xalq aşığı sözə böyük dəyər vermiş, ən yüksək qiymətə layiq görüb onu qızıla bərabər tutmuş, yerində, məqamında deyilməmiş hədər sözün insanı doğrayıb kəsməsini söyləyir (Atalar demişdir: «Qılınc yarası sağalar, söz yarası sağalmaz»). Nizami müdrikliyinə söykənərək («hər

sözü az demək daha xoş olar») «Hər nə söhbətin var, eylə müxtəsər» hikmətamiz fikri müdafiə edir.

Aşıq Şəmşirin şeirlərinin dilini diqqətlə araşdırmaqla belə bir həqiqəti qəbul edirik ki, ustadın ölçüyəgəlməz dərəcədə zəngin leksikonu vardır. Onun əsərlərində bədii söz yüksək dərəcədə ali məqsədlərə xidmət edir, ana dilimizin ifadə imkanlarını bütün genişliyi ilə açıb göstərir, ədəbi dilimizi məna incəlikləri ilə dolğunlaşdırır, yeni-yeni çalarlar, cümlə quruluşları, intonasiya rəngarəngliyi yaradıb bədii üslubun ixtiyarına, dövriyyəsinə verir.

El aşığının dilində işlənmiş aşağıdakı xalq deyimlərinin, frazeoloji birləşmələrdən bir silsilə vermək yerinə düşərdi: **Könlü açılmaq, cida düşmək, eyni açılmaq, qəlbi dağa dönmək, üzü gülmək, köçüb getmək, (dünyasını dəyişmək), ayrı düşmək, soraq vermək, xatirini əziz tutmaq, şam başına dolanmaq, dəngəsər eləmək, rəhmi gəlmək, üzüağ eləmək, buludtək dolmaq, kam almaq, xətrinə dəymək, könül həmdəmim, söz bazarı, bel bağlamaq, can vermək, tələ qurmaq, dilinə qadağa vermək, çəhlim salmaq, beli doğanaq olmaq, qürrə atmaq, qəlbi doluxmaq.** və s. Bu cür frazeoloji birləşmələr yüzlərlədir: Biz burada göstərdiklərimizlə kifayətləndik… Bir cəhəti də deyək ki, belə ifadələrdən eləsi var ki, Azərbaycan dilinin izahlı lüğətinə düşməyib. Məsələn: Kimdənsə sidqi sınmaq:

*Səbəb nədir axır məndən,*
*Gözəl, sidqin sınıb sənin?*

Bu ifadə «üzü dönmək, incimək» anlamını verir.

Daha bir nümunə – beli doğanaq olmaq:

*Saqqal ki, ağardı, gəzmə cavanlıq,*
*Qocalıqda bu iş, lələ, çətindi.*
*Qədd əyilir, belin olur doğanaq,*
*Umid olma o düzələ, çətindi.*

Aşıq Şəmşir 87 illik ömrünü cənnət-məkan sazın-sözün beşiyi Kəlbəcərimizdə, el-oba içərisində, toyda-yığnaqda, şənliklərdə başa vurub. Xoşbəxtlikdən qaçqınlıq, köçkünlük acısını, faciəsini yaşamayıb, görməyib. Onun ağlına belə gəlməzdi ki, bir gün (1993-cü ilin aprelində) Kəlbəcər işğal olunacaq.

Ustad öz şeirlərində ədəbi dilimizdə işlənməyən «qarçıqay», «pəsinmək» (çəkinmək), minək day (üçyaşar at), fasıq (hiyləgər), yoncumaq

(yalvarmaq), «Xuban» (camaat, rəiyyət), «uylaşmaq» (yaraşmaq) və b. sözlərdən istifadə etimşdir ki, bu sözlər də ədəbi-bədii dilin malı ola bilər:

*Cəsarətdə, məharətdə tanınmış*
*Dəryadan dənizdən pəsinməz keçər;*

*Qaraquşun sar olmasa dayısı,*
*Deyərlər bir minək day götürərmiş…*

*Olmaz bundan qədirbilən,*
*Bir fasıqdı, üzə gülən…*

*Yoncumaram hər qadına,*
*Düşmüşəm püran oduna.*
*Sən məni tez-tez yadına*
*Sal, başına dönüm, gəlin!*

*Məni eşqə salan qarçıday, laçın,*
*Aşığı yandırıb yaxış.ı*
*Abad olur yaylaqları,*
*Xubanların oylaqları.*

Dədə Şəmşirin şeirlərində əsasən, Kəlbəcər ellərinin coğrafiyasını cızan, təsvir edən yer-yurd adlarının da aydın mənzərəsinin şahidi oluruq. Onomastik adlar – el-oba, yer-yurd, nəsil adları tariximizin diri qədimliyidir, ulu yüzillərin nişanələridir. Bu adların müxtəlif məxəzlərdə qorunub hifz olunması qədim Azərbaycan türklərinin minilliklərlə ölçülən tarixinin yadigarlarıdır. Bu gün vətənimizin 20 faiz torpaqları erməni əsarətindədir. Bir həqiqəti izləsək ki, erməni vandalları, cəlladları yer-yurd adlarımızı saxtalaşdırır, izini-tozunu silmək üçün erməniləşdirərək dəyişdirirlər, onda Aşıq Şəmşirin şeirlərində qorunan, əxz olunan bir silsilə xüsusi adların əhəmiyyətini təsəvvür etmək, dərk etmək asanlaşar. İndi bunları sıralayaq:

Dağ adları: **Qonur, Qoşqar, Kəpəz, Murov, Dəlidağ, Sarı dağ, Dovudlu, Qurcan yalı, Çöplu dağı, Buzluq, Çilgəz, Qeyti, Qafqaz, Çiçəkli, Günəş dağı, Ağdaş, Pilov dağı, Çolpan, Sarı yal, Şişqaya, Çiçəkli, Ərgünəş, Çalbayır, Damcılı, Bezirqand, Şahdağı, Qızılarxac, Qaraxaç, Məndil, Çanalı dağı, Qanlı dağ, Daşarası, Şişdağ, Çöplüdağı, Sarıdağ.**

Kənd, qəsəbə, yaylaq, bulaq, düz, meşə, biçənək və şəlalə adları:

**Köhnə Ağdaban, Dəmirçidam, Çayqarışan, Ceyranbulağı, İstisu, Həmzəçəmən, Sərt eniş, Şırransu, Yəhəryurd, Qalayçı, Şaban, Carcarlıq, Kəklik, meşə, Mirzəçəpəri, Çilik yalı, Taxtadüzü, Buzluq, Keyvir bulaq, Turşsu, Quşyuvası, Qurçan yalı, Tala, Geyti, Gürnəş daşı, Şəfibiçən, Ələmağacı, Qoçunun beli, Çay çəpəri, Göyçə, Səslənən qaya, Göy qum, Daşbulaq, Qarmaq itirən, Behbudallar yalı, Qazaxlar düzü, Qanlı yurd, Qabaq qılıncı** və s. təxminən 80 ad.

Əgər ustadın əsərləri külliyyatındakı bütün toponim, oykonim, etnonim və bütövlükdə mikrotoponimləri qeydə alıb, statistik hesablama və linqvistik təhlil aparılsa, yüzlərlə onomastik adın təhlilini vermək olar. Bunun üçün zəhmətə qatlaşıb dərin araşdırmalar aparmaq lazımdır. Buna isə böyük zərurət duyuruq.

Qoca Şəmşir vaxtilə qarış-qarış gəzdiyi bu yerlərdən ayrılmağı ürək ağrısı ilə, təəssüflə dilə gətirir:

***Qoca buzluq, Çöplu, Alxan*** *–*
***Dərəsindən*** *duman qalxan.*
*Mənəmmi qəlbi doluxan?*
***Alagözdən*** *ayrılıram.*

*Yolum düşmür ora çoxdan,*
*Fəramuşam səd soraqdan.*
***Çilik yalı, Daşbulaqdan***
***Taxtadüzdən ayrılıram.***

Nəzərinizə çatdırırıq ki, ustad Dədə Şəmşirin dilini bütövlüklə araşdırıb bu məqaləni yazmaq üçün onun 200-dən çox qoşması, 63 təcnisi, 16 ustadnaməsi, 57 gəraylısı və 3 deyişməsini təhlil edib ümumiləşdirmələr aparmışıq. Bu, olsa-olsa azman sənətkarın şeirlərinin dil xüsusiyyətlərinin öyrənilməsində başlanğıc cəhd sayıla bilər. Biz sözümüzü ölməz, həmişəyaşar ustadın bu misraları ilə başa vururuq:

*Birdi arzu, birdi fikir,*
*Onçun sevir səni Şəmşir.*
*Ürəyi bir, çörəyi bir.*
*Ellərimə qurban olum*
*Ellərimə qurban olum!!!*



Savalan FƏRƏCOV

# AŞIQ VALEHİN HƏYAT EŞQİ, SƏNƏT DÜNYASI

*Aşıq yaradıcılığı bütün zamanlarda bənzərsiz ənənələri ilə insanlarda dərin maraq doğurub. Bu sənətin görkəmli nümayəndələrindən biri də sorağı Qarabağın hüdudlarını aşan və adı, şöhrəti xalqın yaddaşında əbədiləşən Aşıq Valehdir.*

Yaradıcılığı ustad sənətkarlar tərəfindən yüksək dəyərləndirilən, adı uzaq-yaxın ölkələrdə hörmətlə anılan Aşıq Valeh 1729-cu (bəzi mənbələrdə 1722) ildə Ağdamın Abdal Gülablı kəndində dünyaya göz açıb. Əsl adı Səfi, atasının adı Məhəmməd olub. Erkən yaşında atası onu Molla Mahmudun yanına aparır. Oğluna elmin əsaslarını öyrətməsini xahiş edir. Səfi yeddi il ondan dərs alır, ərəb, fars dillərini, Quranı mükəmməl öyrənsə də, molla olmaqdan imtina edir. Atasının razılığı ilə dövrünün hörmətli sənətkarlarından Aşıq Səmədin yanına gedir və onun şəyirdi olur.

Aşıq Səməd Valehin saza-sözə olan hədsiz həvəsini görüb, onun parlaq gələcəyinə inanır. Məhz buna görə aşıqlıq sənətinin ən incə sirlərini öyrətməkdən usanmır, öz istedadlı şagirdini böyük məclislərə aparır, sınaqlardan keçirir. Hətta deyilənə görə, "Valeh" təxəllüsünü də ona ustadı Aşıq Səməd verib. Belə ki, o, gənc yaşlarında gözəl bir qıza aşiq-valeh olur və bundan sonra ustadı ona bu təxəllüsü verir. Bununla belə, Səfinin həmin qızla ailə qurub-qurmaması barədə araşdırmalarda elə bir səhih məlumat yoxdur. Bu barədə ancaq aşığın bizə gəlib çatan "Vücudnamə"sində söz açılır. Aşıq Valeh orada həyatının uşaqlıq və gənclik illəri, məktəbdə oxuması, on beş yaşından eşqə düşməsi, ailə qurması, gəzdiyi yerlər və görüşdüyü şəxslər haqqında danışır. Akademik Həmid Araslı bununla bağlı qeyd edib ki, alim-tədqiqatçılarımızın yeri gələndə öz fikirlərinin təsdiqində şair-aşıqlar tərəfindən yaradılan "Vücudnamə"lərə istinad etməsi məqsədəuyğundur. Aşıq Valeh orada özü haqqında deyir:

*Səkkizdə, doqquzda Quranı seçdim,*
*On yaşında yaxşı-yamanı seçdim.*

*On birimdə Quran kitabı seçdim,*
*On beşimdə sərim doldu sevdaya.*

Yaxud:

*Valeh ləqəbimdir, Səfidir adım,*
*Allahı sevənlər, budur muradım...*

Onu da qeyd edək ki, akademik Həmid Araslı, folklorşünas Əhliman Axundov, professorlar Məmmədhüseyn Təhmasib, Vaqif Vəliyev, Paşa Əfəndiyev və başqa alimlərimizin Aşıq Valehin yaradıcılığı haqqında dəyərli fikirləri var.

Məlumdur ki, XVIII əsrdə aşıq poeziyasının, aşıq şeirinin yazılı ədəbiyyata təsiri böyük olub. Göründüyü kimi, Valehin yaradıcılığı da məhz bu dövrə təsadüf edib. Yazıb-yaradan şairlərlə aşıq-şairlər arasında da müəyyən yaxınlıq, dostluq olub. Onlar hətta deyişib, bir-birilərinə nəzmlə məktub göndəriblər. Bu zaman Aşıq Valehin sıx əlaqə saxladığı, yaradıcılıq söhbətləri apardığı sənətkarlardan biri də Molla Pənah Vaqif (1717-1797) idi. Bu, Valehin şeirlərində tam aydın görünür. 1807-ci ildə aşığın yazdığı şeirdə deyilir:

*Ustad Səməd sənətdə bir dağ idi,*
*Kələntərli Alı fəndli bağ idi.*
*On il əvvəl Molla Pənah sağ idi,*
*Valeh kimi aşıqlar ustadı var.*

Buradan da Aşıq Valehin M.P.Vaqifə səmimi münasibəti aydın hiss olunur. Digər əsərlərindən də məlum olur ki, Valeh Qarabağda xalqı incidən zülmkarlardan xanlığın baş vəziri Vaqifə bir neçə dəfə müraciət edib:

*Molla Pənah, ərzim sizə söyləyim,*
*Mahallıqca biz düşmüşük dara, bil.*
*Şadlığı axtaran biçarə kəslər*
*Həmdəm olub yenə ahu-zarə, bil.*

Aşıq Valehin dövrünün digər şair və aşıqları ilə də görüşləri, deyişmələri çox olub. Onun Aşıq Cəlalla, ustadı Səmədlə, Aşıq Feyruzla, Məsum Əfəndi ilə, Aşıq Qənbərlə deyişmələri, şair Abdulla Canızadə ilə məktublaşması mənbələrdə öz əksini tapıb. Bu da onun xalq arasında böyük nüfuz sahibi, istedadlı şair-aşıq, olduğunu göstərir.

Gənc yaşlarından ustad sənətkar kimi tanınan Valehin səsi-sorağı Qarabağın hüdudlarından kənarda da eşidilir. Bir neçə il müstəqil aşıqlıq etdikdən sonra özünə şəyird götürüb öyrədir. Sələflərindən gələn ustad-şagird ənənəsini davam etdirir, müasirləri olan Aşıq Qənbərin, Aşıq Cəlalın, Aşıq Əhmədin və başqalarının bir sənətkar kimi formalaşmasında böyük əmək sərf edir. Lakin sənətin sirlərinə tam yiyələnməyən şəyirdi Səməd ondan çox tez ayrılır. Azad aşıqlıq etmək fikrinə düşür, Dərbəndə qədər gedib çıxır. Zərniyar xanımla deyişir və məğlub olur. Xanım aşıq Səməddən ustadının adını soruşur, ondan Valehin ünvanını alır və ustada açıq məktub yazır, Dağıstana – özü ilə deyişməyə dəvət edir:

*Bir neçə aşığı eyləmişəm bənd,*
*Ayağında zəncir, boynunda kəmənd,*
*Adım Zərniyardır, məkanım Dərbənd,*
*Məni anar olsan, bu məkana gəl!*

Məktubu alıb oxuduqdan sonra Valeh Dağıstana yola çıxır, gəlib Dərbənd şəhərinə yetişir. Zərniyar xanımla görüşür-deyişir, onu bağlayır və zindana saldığı aşıqları azad edir. Zərniyar xanımla ailə qurmaq fikrinə düşür. O zaman Valehin 25, Zərniyar xanımın təxminən 18-19 yaşı olur. Deyilənə görə, bu xanım 1730-cu ildə Dərbənddə dünyaya gəlib. Erkən çağlardan şeirə, sənətə, saza böyük həvəs göstərib. Buna görə də əhd edir ki, şair-aşıqlıqda onu bağlayana ərə gedəcək. Çox aşıqlar onu bağlamaq fikrinə düşür. Buna cəhd etsələr də, məğlub olurlar. Nəhayət, Valeh onu bağlayır və onunla evlənir. Zərniyarı da götürüb Abdal Gülablıya gəlir. Ömürlərinin sonuna qədər bir-birilərinə sadiq həyat sürürlər...

Aşıq Valeh 1822-ci ildə Şuşa şəhərində vəfat edib. Zərniyar xanım isə 1840-cı ildə dünyasını dəyişir, Abdal Gülablıda dəfn olunur. Məzarının başdaşında bu bənd həkk olunur:

*Vəfai-eşqdə düz ilqar mənəm,*
*Sadiqi-aşiqə vəfadar mənəm.*
*Məkani Dərbəndəm, övrəti Valeh,*
*Sorağı dastanlı Zərniyar mənəm.*

Ümumiyyətlə, istər deyişmələrindəki qoşmalardan, istərsə də ayrı-ayrı şeirlərindən məlum olur ki, Zərniyar xanım dərin kamal sahibi, mütərəqqi fikirli bir ziyalı qadın olub. Təəssüf ki, onun tərcümeyi-halı və yaradıcılığı geniş araşdırılmayıb...

**Şair Nəbi Miskin – 140**

**Səməndər MƏMMƏDOV**



# “MƏN NƏBİYƏM, AŞIQLARIN ZƏRİYƏM”

Türk dünyasının böyük söz fatehi ZəlimxanYaqubun bir müdrik kəlamı var: “Bizə, qalın kitablar yox, qalan kitablar lazımdır”. Bu mənada təkcə Borçalıda deyil, Azərbaycan, Türkiyədə və Cənubi Azərbaycanda da sevilə-sevilə oxunan şair Nəbi Misginin bütövlükdə yaradıcılığı başdan-başa qalan şeir nümunələri, ədəbi abidələrdir.

Elə bir təhsili olmasa da, şair Nəbi o qədər məzmunlu, məntiqli şeirlər yazıb ki, istər-istəməz onun şeirlərini oxuyanda adamın ruhu qanadlanır. Xalq şairi Zəlimxan Yaqubun dediyi kimi, şair Nəbi Azərbaycan aşıq şeirinin bütün növlərində bir-birindən gözəl, qiymətli ədəbi nümunələr yaradıb. Onun şeiirləri bizim sümüyümüzə, iliyimizə işləyib. Onu bu gün hər yerdə böyük bir el nəğməkarı kimi xatırlayırlar. Bu, ona verilən ən böyük qiymətdir.

Borçalının elə bir rayonu, elə bir kəndi olmaz ki, ən azından ağsaqqallar şair Nəbinin şeirlərini əzbərdən bilməsinlər. Şair Nəbinin şeirlərini ən çox oxuyan, təbliğ edən və yayanların sırasında başda unudulmaz ustad aşığımız Hüseyn Saraçlı dayanır.

Nəbi Oruc oğlu 1873-cü ildə Borçalı mahalının ağır ellərindən olan Faxralı kəndində yoxsul kəndli ailəsində anadan olub. Körpə Nəbinin dünyaya gəldiyi gündə bu kasıb ailə eyni zamanda bir kədərə də düçar olub: Nəbinin böyük qardaşı Həsənin əlindən xəta çıxıb, yerli bəylərdən birinin yaxın adamını öldürdüyünə görə ömürlük sürgün edilib. Ehtiyac içində böyüyən Nəbi erkən yaşlarından zəhmətə qatlaşmalı olub. Qonşu kənddə varlı bir şəxsə nökərçilik edib. İti hafizəsi, hazırcavablığı ilə fərqlənən yeniyetmə Nəbi axşamlar kənd toylarına gedib aşıqları maraqla dinləyirmiş. İlk qoşma-təcnis və müxəmməslərini yaradan gənc Nəbi

toylardan birində öz dövrünün tanınmış sənətkarlarından olan Aşıq İsmayılla deyişməyə girişib və ona qalib gəlibmiş...



Şair Nəbi 1890-cı ildən 1910-cu ilə kimi müxtəlif yerlərdə nökər, çoban, mülkədar malikanəsində gözətçi, Tiflisdə, Allahverdi mis mədənlərində fəhlə işləyib. Yazı-pozu öyrənməyə vaxtı və imkanı olmadığı və gürcü dilini yalnız güclü hafizəsi sayəsində mükəmməl mənimsədiyi bildirilsə də, şair Nəbinin dərin savada və geniş dünyagörüşünə malik olması onun yaradıcılığından aydınca görünür.

1910-cu ildən etibarən peşəkar bir sənətkar kimi toy və el şənliklərində xalqa mənəvi xidmət göstərən şair Nəbi ömrünün axırına kimi Faxralı kəndində yaşayıb-yaradıb. 1945-ci ilin mayında alman faşizmi üzərində qələbənin qazanılması xəbəri isə onun üçün az təsəlli olub. Çünki buna qədər o, cəbhəyə göndərdiyi dörd oğlundan ikisinin qara kağızını almışdı. Yeri gəlmişkən qeyd edək ki, cəbhədən qayıtmayan oğlanlarından biri – Nadir də şeir qoşurdu. Hətta onun atası ilə deyişməsi də var.

Elə həmin ilin oktyabr ayında 72 yaşında dünyasını dəyişib Nəbi Misgin.

Şair Nəbinin poetik irsinə, ədəbi həyatına işıq tutulmasının əsas səbəbkarı böyük şairimiz Səməd Vurğun olub. Osman Sarıvəlli ilə birlikdə 1955-ci ilin oktyabr ayında Faxralı kəndinə təşrif buyuran Səməd Vurğun elimizdə müqəddəs sayılan Molla Qurban ocağında iki gün qonaq qalıb. Qonaqların şərəfinə düzənlənən və o vaxtlar Faxralı kənd orta məktəblərində direktor vəzifəsində çalışan ədəbiyyat müəllimi, sonralar Azərbaycanda görkəmli folklorşünas kimi tanınan, Dədə Qorqud haqqında sanballı tədqiqat əsərləri yazan Hüseynqulu Məmmədli, Hacı Həsənov və digər ziyalıların iştirak etdiyi məclisə Aşıq Nəsib də dəvət edilib. Aşıq Nəsibin şair Nəbidən oxuduğu şeirlər Səməd Vurğunun dərin marağına səbəb olub, xüsusən də bir beyt diqqətini çəkib:

*...Qılıncın qınsızdı, qolun qüvvətli,*
*Baxmadın qocaya, cavana, dünya!*

"Dünya" rədifli həmin qoşmanı bir daha oxutdurub dinlədikdən sonra Səməd Vurğun həmin beyti "Kazbek" siqaret qutusunun üstünə yazır, üzünü hörmətli Hüseynqulu müəllimə tutub: "Çox gözəl ədəbi nümunələrdi, – deyir, – yaradıb şair Nəbi Misgin. Özünüz ədəbiyyat müəllimisiniz, mən sizə tapşırıram, şair Nəbinin şeirlərini toplayın. Bunların itib-batmasına yol vermək olmaz. Gözəl şeirlərdir, qoy ədəbi ictimaiyyətə təqdim olunsun. Siz toplayın, nəşrinə Osman müəllim kömək edər".

Elə o illərdən Hüseynqulu müəllim şair Nəbinin şeirlərini toplamağa başlamışdır. Həmin şeirlərin aqibəti barədə Hüseynqulu müəllimin oğlu, AMEA Folklor İnstitutunun Aşıq yaradıcılığı şöbəsinin müdiri, filologiya üzrə fəlsəfə doktoru, Əməkdar mədəniyyət işçisi Elxan Məmmədli belə yazıb: "Şair Nəbinin irsinin müəyyən qismi hələ S.Vurğun vəfat etməmişdən bir qədər əvvəl toplanmışdır. S.Vurğunun vəfatından sonra Hüseynqulu Məmmədov tərəfindən toplanılan bu şeirlər bir qədər Azərbaycan SSR EA Ədəbiyyat İnstitutunun folklor şöbəsində, bir neçə il Yazıçılar İttifaqının seyflərində, on ildən artıq "Yazıçı" nəşriyyatında qaldıqdan sonra nəhayət, 1991-ci ildə nəşr olunmuşdur. Kitabın nəşrinə qədər və ondan sonrakı illərdə dövrü mətbuatda Hüseynqulu müəllimin bir sıra məqalələri "Ədəbiyyat və incəsənət" və "Sovet Gürcüstanı" qəzetlərində dərc olunmuşdur. Daha sonra şair Nəbinin "Bilmədi", "Gözəl" rədifli şeirləri 1964-cü ildə Azərbaycan Dövlət Nəşriyyatı tərəfindən Əhliman Axundovun tərtib etdiyi "Telli saz ustadları" kitabına daxil edilmişdir".

Hüseynqulu Məmmədlidən sonra Şair Nəbinin yaradıcılığı folklorşünas alim Elxan Məmmədli tərəfindən daha geniş şəkildə tədqiqata cəlb edilib, eləcə də, mərhum akademik Valeh Hacılar, dosent Pənah Mahmudov, filologiya elmləri doktoru, professor Şurəddin Məmmədli, Arif Əmrahoğlu, Osman Əhmədoğlu, professor Mahmud Kamaloğlu və tədqiqatçı-dissertant Arzu xanım Bayramlı və digər tədqiqatçılar da onun yaradıcılığına müraciət edibər.

Hüseynqulu Məmmədli tərəfindən toplanılmasına başlanılan şeirləri Nəbi Misginin anadan olmasının 130 illiyi ilə bağlı olaraq 2003-cü ildə AMEA Folklor Mərkəzinin Elmi Şurasının qərarı ilə nəfis tərtibatda işıq üzü görmüşdür. Kitabın tərtibçisi və nəşrə hazırlayanı Elxan Məmmədlidir.

AMEA Folklor İnstitutunun Elmi Şurasının 29 yanvar 2013-cü il tarixli 1 saylı qərarı ilə nəşr olunan "Sığındım Mövlaya" adlı kitab isə Nəbi Misginin bu il qeyd olunacaq 140 illiyinə layiqli hədiyyədir. Bu kitabın araya-ərsəyə gəlməsində də Elxan Məmmədlinin zəhməti

böyükdür. Burada qeyd etmək lazımdır ki, Hüsyenqulu Məmmədli Şair Nəbinin bütün külliyyatını toplasa da, 1991-ci ildə nəşr olunan "Yazılanlar gəldi başa" adlı kitabda şairin dini mövzuda olan şeirləri yer almamışdı. Bu il nəşr olunan kitabda isə həmin şeirlər də öz əksini tapıb.

Xalq şairi Zəlimxan Yaqubun dediyi kimi, şair Nəbinin şeirləri arasında elə tutumlu, elə dolu nümunələr vardır ki, hər biri bir kitaba dəyər.

*Səhərdən bəklədim mən yollarını,*
*Bir gəlib qarşımdan ötəsən, gözəl!*
*Sən özün bilmirsən öz murazını,*
*Mən yaxşı bilirəm butasan, gözəl!*

*Yetmişə yetsən də, mən səni allam,*
*Dərgah-ilahiyə min dua qıllam.*
*Aylarnan xəstə düşsəm, sağallam,*
*Sən gəlib qolumdan tutasan, gözəl!*

*Mən Nəbiyəm, aşıqların zəriyəm,*
*Yanıram oduna, eşq əsəriyəm.*
*Gəlmişəm qapına, bil, müştəriyəm,*
*Ləbinin balından satasan, gözəl!*

*Bir başqa misal:*

*...Ləblərimlə ləblərindən gül üzəm,*
*Ac arıtək qonam, soram, bal çəkəm.*

*Yaxud*:

*...Günü-gündən bu gözəllik kəmələr,*
*Bar verib sinəndə bir cüt məmələr.*
*Lazım budu, tamarzılar əmələr,*
*Fəsildə qızarmış qönçə nar kimi.*

Göründüyü kimi, nə qədər tutumlu, mənalı, məzmunlu beytlərdi.

Şair Nəbi bizim o vaxt yazıb-yaradan digər aşıqlara təkan, qol-qanad verib. Təsadüfi deyildir ki, şeirlərinin birində deyirdi: "Mən Nəbiyəm, aşıqların zəriyəm". Deyilənlərə görə, şair Nəbi deyişmə zamanı bir dəfə də olsun məğlub olmamış, qalib gəldiyi rəqibinin də heç

vaxt sazını əlindən almamışdır, əksinə, məğlub olanlara ürək-dirək vermiş, onları pərt olmağa qoymamışdır. O, cılız maraqlardan, paxıllıq hisslərindən yüksəkdə dayanan bir şair olmuşdur. Şeirlərindən birində o dövrdə nisbətən cavan şairlər haqında belə deyib:

*Səxavət əhlidi, Alıynan Şaban,*
*İnşallah, çatallar bizə şairlər.*

Şeirdən də göründüyü kimi, Misgin Nəbi həmkarlarının hər ikisini şair kimi qiymətləndirir, eyni zamanda onların hələ cavan olduqlarını xəfifcə vurğulayır. Həmin gənclərdən biri – şair Alı II dünya müharibəsində həlak olub – yaradıcılığının çıçəklənən vaxtında ömrü yarıda qırılıb. Aşıq Şaban isə Allah verən ömrü tam yaşadı, gözəl şeirlər, deyişmələr yaratdı.

Folklor İnstitutunun dissertantı Arzu Bayramlının araşdırmasına görə, XIX əsrin sonu və XX əsrin ilk iki onilliyini əhatə edən dövrdə, yəni şair Nəbinin yaşayıb-yaratdığı dövrdə Borçalıda fəaliyyət göstərən 116 poeziya təmsilçisindən 36 nəfəri şair, 61 nəfəri el şairi, 19 nəfəri isə yaradıcı aşıq olub. A.Bayramlı “El şairi Nəbi Faxralının həyat və yaradıcılığına baxış” məqaləsində yazır: “Bu qədər söz adamının arasından şair Nəbinin ustad məqamına çatması, şöhrətlənməsi əlbəttə ki, yalnız böyük istedadın nəticəsi ola bilərdi. Əhəmiyyətli olan bir məqam da budur ki, şair Nəbi kimsəyə şəyirdlik etməmiş, kimsədən söz sənətinin sirlərini öyrənməmişdi, amma özünün bir neçə yetirməsi vardı ki, onlara Allah vergisi olan şairliyinin sirlərinə vaqif olmağa imkan vermişdir”.

Məhəbbət mövzulu qoşmaları şair Nəbinin yaradıcılığında mühüm yer tutur və bu şeirlərində ülvi duyğuların vəsfinə geniş yer verilir. Filoloq-alim Elxan Məmmədli çox düzgün qeyd edir ki, şair Nəbi bu qəbildən olan qoşmalarında lirik qəhrəmanın zahiri və daxili gözəlliyinin vəhdətdə olmasını vacib sayır. Məhəbbətdə xəyanəti, vəfasızlığı, riyakarlığı pisləyir.

*Nəbim deyər, nədən oldu yar ası,*
*Yaman olu yarın qəlbiqarası.*
*Könlümün sevdiyi, ömrüm çarası,*
*Sərin gizlər, gözüm qaldı bu dərdə.*

Diqqəti çəkən bir məqam da şair Nəbi poeziyasının təbiətlə harmoniya təşkil etməsidir. Onun Aşıq Ələsgərin “Dağlar” şeirinə iqtibası bu nöqteyi-nəzərdən çox maraqlıdır:

*...Səhər-səhər dan yelləri əsəndə,*
*Şərbət bulaqların tən edər qəndə,*
*Yığılar gözəllər, dövr edər səndə,*
*Çiçəkli, çəmənli gül olu dağlar...*

*...Şair Nəbi səndə gəzdi bir zaman,*
*Çəkilməz sərindən çiskinli duman.*
*Çuxur, Günavarda bənövşə, reyhan,*
*"Süsənli, sünbüllü, lalalı dağlar".*

Şair Nəbi dövrünün haqsızlıqlarına, cəmiyyətdə gördüyü ədalətsizliklərə qarşı da öz etiraz səsini ucaldıb.

Nəbi Miskinin şeirləri, cinaslı təcnisləri, divaniləri, müxəmməsləri ilə yanaşı rəvayət və deyişmələri, bir-birindən gözəl dastanları da var. Ədəbiyyat uzmanları şair Nəbinin mənzum yaradıcılığında özünü az qala hər addımda büruzə verən ürfani mətləbləri, müəllifin təsəvvüf dünyagörüşünü xüsusi qeyd edirlər. Bu dünyanın faniliyi, axirət üçün rəhmət qazanmağın daha vacibliyi onun şeirlərinin əsas qayəsini təşkil edir:

*Şair Nəbi, pur kamalı yaxşı bil,*
*Zikr elə, sən gecə-gündüz, ilbəil.*
*Ədəb-ərkanına qayıtmayan qul,*
*Cəhənnəm hazırdı, cənnəti olmaz.*

Şair Nəbi yaradıcılığını izləyəndə bir həqiqətin də təsdiqini tapırıq: mükafat layiq olduqda stimula çevrilir. Şairin qoşduğu məşhur "Mehdi bəyin dastanı"nın aqibəti məhz belə olmuşdur. Haqqında yazılmış kitablarda şair Nəbinin bir gecədə düzüb-qoşduğu həmin dastanın mükəmməlliyi barədə yüksək fikirlər, yaranma tarixçəsi barədə maraqlı əhvalatlar yer alıb. Daha maraqlısı budur ki, şair Nəbinin dastanları necə eşidilibsə, eləcə də şirin Borçalı ləhcəsi ilə yazıya alınıb.

Heç təsadüfi deyil ki, Müzəffər Şükür doğru olaraq Faxralını yox, bütün Borçalını şair Nəbinin yurdu adlandırırdı:

*Qayaları dönməz ordudur,*
*Dərələri duman udur,*
*Şair Nəbinin yurdudur,*
*Müqəddəsdir Borçalımız.*

Şair Nəbinin Aşıq Ələsgərin qıfılbəndinə cavabı da onun zəngin biliyindən və həyat təcrübəsindən, geniş dünyagörüşündən xəbər verir:

**Ələsgər**:

*Dünya altı gündə neçə don geydi,*
*Nə üstə əyləşdi, bərqərar oldu?*
*Əzəli kimiydi ərşin bənnası,*
*Ulduzlar nə təhər yerbəyer oldu*?

**Nəbi**:

*Dünya altı gündə dörd don geyindi,*
*Ab üstə əyləşdi bərqərar oldu.*
*Xey-xalığım haxda ərşin bənnası,*
*Ulduzun yeddisi səyahətkar oldu.*

**Ələsgər**:

*Nə qədərdi müğərrəbin mələyi?*
*Onların içində kim idi bəyi?*
*Canlıdı, cansızdı ərşin dirəyi,*
*Nə ilə çalındı, mötəbər oldu?*

**Nəbi**:

*Pənc-yek ayədi müqərrəbin mələyi,*
*Onların içində Cəbrayıl bəyi.*
*İsmi-əzəm cansızdı, ərşin dirəyi,*
*Çaldı lövhü-qələm, mötəbər oldu.*

**Ələsgər:**

*Ələsgər əl üzməz etiqadından,*
*Yer də xəbər verir göy büsatınnan.*
*Haqqınan peyğəmbər əhvalatınnan,*
*İslamam deyənə nə xəbər oldu*?

**Nəbi**:

*Nəbi də əl üzməz etiqadınnan,*
*Xilqəti hafizdi göy büsatınnan.*
*Haqqınan, peyğəmbər əhvalatınnan,*
*Mərifət İslama o xəbər oldu.*

Nəzərdən keçirdiyimiz nümunə həm də onun göstəricisidir ki, şair Nəbi dindar, Allaha yaxın adam olmuşdur. O, mömin kimi ömür sürmüş, ömrünün sonunacan islamın qanunlarına riayət etmiş, orucundan-namazından qalmamışdır. Xalq arasında şair Nəbinin istedadı "Haqq vergisi", "Allah vergisi" hesab olunurdu. Şairin həyat yolunu öyrənən tədqiqatçıların da qeyd etdiyi kimi, ruhanilərin Misgin Nəbi yaradıcılığına münasibəti birmənalı olmamışdır. Onlardan bəziləri şair Nəbini sınaqdan keçirməyə cəhd göstərmiş, amma uğursuzluğa düçar olmuşdur. Bəli, yalnız qəlbi Tanrıya bağlı olan müsəlman və dərin iman sahibi olması dünyaya gəldiyi gündən (qardaşının əlindən xəta çıxması səbəbindən ailəsinin zillətə düçar olduğu gündən) ölənədək (ömrünün son beş ili iki oğul itirdiyi Böyük Vətən müharibəsi dövrünə təsadüf edib) onu müşayiət edən ağrı-acıya sinə gərməsinə kömək etmişdir.

Zəmanəmizin böyük söz ustadı, Xalq şairi Zəlimxan Yaqub da istər yaradıcılığında, istər çıxış və məqalələrində şair Nəbinin yaradıcılığını həmişə yüksək qiymətləndirib. "Borçalıda qalan izlər" poemasında şair Nəbinin də adını əbədiləşdirməsi dediklərimizə canlı sübutdur:

*Deyəndə Nəbinin "Dünya" şeirini,*
*Aşıq lap Vurğunu sehirləmişdi,*
*"Tapar qiymətini, tapar yerini,*
*Elin sənətkarı ölməz" – demişdi,*[1]
*"Qılıncın qınsızdı, qolun qüvvətli,*
*Baxmadın qocaya, cavana dünya".*

*Ay Osman, gör şair nə gözəl deyib,*
*Ağlının barıdır, qəlbinin səsi.*
*Çatdıraq ellərə, heyifdir, heyif,*
*İt-bata düşməsin bircə kəlməsi.*

Bu il şair Nəbi Miskinin anadan olmasının 140 ili tamam olur. Xalq şairi Zəlimxan Yaqubun rəhbərliyi altında Azərbaycan Aşıqlar Birliyi bu yubileyi layiqincə qeyd etmək üçün hazırlıq işləri görür. İnanırıq ki, bu tədbirlər böyük coşqu, hərarət və məhəbbətlə müşayiət olunacaqdır. Və elə buradaca özümün və və şair Nəbini yetirən Faxralı kəndinin – faxralıların bir arzusunu da dilə gətirmək istəyirəm: bu yubiley şairin adına layiq onun doğma yurdunda da qeyd olunsun. Onun ruhuna hörmət kimi adının əbədiləşdirilməsi, Faxralı kəndində ona abidə ucaldılması isə saza, sözə verilən qiymət kimi təkcə faxralıların yox, borçalıların arzusudur. Nəbi Miskin bu ehtirama, bu diqqətə haqqı olan şairdir.

## Könlümün tərcümanı saz



**Sədnik Paşa PİRSULTANLI**
*professor, filologiya elmləri doktoru*

### Bəri

Söylə, tarixini, a telli sazım,
Sən varsan, Harutdan, Marutdan bəri.
Sənin ilk səsini Musa eşitmiş,
Gəzmisən Dəclədən, Faratdan bəri.

Sənin ağacını yonmuş kor şeytan,
Sənin möcüzəni danmış kor şeytan,
Əlindən çıxanda yanmış kor şeytan,
İnsan əlindəsən Davuddan bəri.

Sinəndə Davudun əlləri gəzdi,
Sən oldun o gündən Davud avazlı.
Peyğəmbər payıdı, böyük murazdı,
Danış tarixini Bozqurddan bəri.

Dədə Heykəllini, Dədə Qürbəti,
Dədə Yediyarı unutmam qəti.
Çağır ozanları, çağır milləti,
İmtahan eyləyək Qorquddan bəri.

Sədnikin dastanı, sözü varıydı,
Dünyanın Gəncədə gözü varıydı.
Gəncənin qopuzu, sazı varıydı,
Keçəndə Qurbani o yurddan bəri.

### Aşıq

Elə bir millətin övladısan ki,
Sənin öyünməyə haqqın var, aşıq.
Təhmasib aşığa "işıq" deyibdir,
Qəlblərə bir nursan, aşikar, aşıq.

Sazınla ucalır sözün şöhrəti,
Şair yazır, aşıq verir ziynəti.
Qəlbində el ruhu, el məhəbbəti,
Hər sözü tarixdə yadigar aşıq.

Sədnik deyər, unutmaram mən sizi,
Sizlə tapdım ilk cığırı, ilk izi.
Qorqudlu, Abbaslı keçmişimizi,
Yaşaya-yaşaya yaşadar aşıq.

### Aşığın

Aşıq kimdi – məclislərin bəzəyi,
Hə söhbəti bal-şəkərdi aşığın.
Doymaq olmur avazından, sazından,
Hər dastanı ləl-gövhərdi aşığın.

"Kərəmi"si səni oda yandırar,
"Rühani"si keçmişləri andırar...

"Koroğlu"su köhlənlərə mindirər,
Hər çağrışı bir zəfərdi aşığın.

Möcüzədir, bu sənətdə nələr var,
Sədnik, min sirri var, kim eylər aşkar?
Dədə Qorqudumdan qalıb yadigar,
Hər kəlməsi simuzərdi aşığın.

### *Mənim*

İnci, sədəf söz karvanım,
"El havası" varım mənim.
Sona kimi cilvələnir,
"Göyçə gülü" yarım mənim.

Hələ var, eşqim, həvəsim,
Məclislərdən gəlir səsim.
"Gözəlləmə"m, "müxəmməs" im,
Öz əhdim, ilqarım mənim.

"Sarıtel"lər cavan çağım,
"Gəraylı" güllü yaylağım.
"Yurd yeri"di qəm oylağım,
"Dilqəm"di ah-zarım mənim.

"Kərəmi"lər ağlar gözüm,
"Rühani"də qalıb dözüm.
"Dübeyti"lər qışım, yazım,
"Vanağzı" ağ qarım mənim.

"Şah Xətai" bir yaddaşdı,
Tariximdə qanlı daşdı.
Sədnik, demə, meydan boşdu,
"Koroğlu"lar zorum mənim.

### *Söz*

Varlığını qılınc kimi yarar söz,
Şana çəkər tellərini darar söz,
Xəzinədir, nə istəsən verər söz,
Orduların etmədiyin edər söz.

Mənim xalça-xalımdı söz,
Dövlətimdi, malımdı söz,
Düşüncəm, xəyalımdı söz,
Öz danışan dilimdi söz.

Onu məndən alammazsan,
Sözdə Sədnik olammazsan.
Sözüm qızıl kərpicimdi,
Sözüm qızıl sarayımdı.

Sözüm külli-kainatım,
Sözüm Günəşim, Ayımdı.
Sevginən sözü söz kimi,
Kirpik qoruyan göz kimi.

Mənim doğma ana dilim,
Zaman-zaman yaşayacaq.
Hələ çox iş görəcəkdi,
Xətaitək, Füzulitək,
Vurğun kimi bu millətə,
Çox dahilər verəcəkdi.

### *Şeirim*

Damcı-damcı misralara axmısan,
Sən mənim qəlbimin qanısan, şeirim!
Sənin sevincindən mən doymamışam,
Ömrümün ən xoşbəxt anısan, şeirim!

Duru desəm, çeşmələrdən durusan,
Gözlərimin şöləsisən, nurusan,
Sevən könlün həmdəmisən, yarısan,
Dünyasan, özünü tanısan, şeirim!

Çiçəktək açılıb, solan da sənsən,
Könlümü qəmlərə salan da sənsən,
Buludtək boşalıb, dolan da sənsən,
Sən elə Sədnikin canısan, şeirim!

**Mahmud KAMALOĞLU**
*professor*



# AŞIQ MƏSİM BƏYAZİDLİ

19-cu yüz ilin sonu, 20-ci yüz ilin əvvəllərində Borçalı aşıq məktəbi özünün ən yüksək inkişaf mərhələsinə qalxmışdır. Bu dövrün azman Borçalı ustad aşıqları türk dünyasında tanınmış ünlü sənətkarlar olmuşlar. Heç də təsadüfi deyildir ki, bir üzü İran, bir üzü Turan bütün türk dünyası ozanlarının həmin dönəmlərdə Tiflisə yığılması da məhz həmin səbəblərdən irəli gəlmişdir. Bir sözlə, təkzibedilməz faktdır ki, bu dövrdə türk dünyası aşıqlarının mərkəzi qədim Tiflis şəhəri idi.

Belə bir zamanda, yəni sənətkar kimi əlində saz Tiflisdə ortaya çıxmaq hər aşığın ağzı deyildi. Məhz belə bir dövrdə – aşıq sənətinin qızğın və keşməkeşli çağında Tiflis kimi şəhərdə ustad aşıqların ortasında meydan oxuyan azman sənətkarlardan biri də Aşıq Məsim Bəyazidli olmuşdur.

Məsim Qasım oğlu Bəyazidli (Yadigarov) 1889-cu ildə Borçalı mahalının Şamalı kəndində dünyaya göz açmışdır. Ancaq o, lap körpə ikən bölgədə baş verən təbii fəlakət həmin kəndi dağıtdıqdan sonra bir çox həmkəndliləri kimi, onların da ailəsi qonşu kəndə – Bəyazid kəndinə köçmək məcburiyyətində qalır. Məsimin uşaqlıq və gənclik illəri məhz Bəyaziddə keçir, o, bu kənddə boya-başa çatıb, ustad səviyyəsinə yüksəlir.

Sonralar, yəni Sovet dövründə Bəyazid kəndi Qayaqocalı kəndi ilə birləşdirilərkən bu iki yaşayış məntəqəsi bir inzibati ərazi vahidi kimi göstərildiyi zaman iki kənddən birinin adı saxlanır. Yəni Qayaqocalı adı qalır, Bəyazid isə xalqımızın tarixindən birdəfəlik silinir.

Yeri gəlmişkən, onu da qeyd etmək maraqlıdır ki, Borçalı xəritəsindən silinmiş hər iki kənd – Şamalı və Bəyazid kəndləri hazırkı Marneuli rayonunun Qırxılı, Qayaqocalı və Qullar kəndlərinin ətrafında mövcud olmuşdur.

Elə buradaca onu xüsusi ilə vurğulamaq istərdim ki, Aşıq Məsim özünə təxəllüs kimi götürdüyü Bəyazid adını tarixdə əbədi yaşatmaq kimi bir şərəfə də nail olmuşdur.



Gəncliyindən Aşıq Məsim Bəyazidli saza-sözə çox güclü bir meyil salmışdır. Nə qədər gözəl səsə, saz çalmağa, güclü hafizəyə, az-çox söz qoşmaq qabiliyyətinə malik olsa da, gələcəkdə yaxşı bir aşıq olmaq üçün mütləq ustada qulluq etmək vacib olduğunu heç vaxt yadından çıxarmır. Elə bu məqsədlə də Borçalıda o dövrlərdə çox ad-san qazanmış ustad sənətkar Dollu Əbuzərin yanına gedir. Dollu Əbuzər (1856-1912) əslən Dol mahalından olub, Borçalıya sonradan gəlsə də, onun dədə-babaları Borçalı Qarapapaqlarından idi. Gənclik illərində Borçalıya gəlib burada evlənən Aşıq Əbuzər bir müddət Kəpnəkçidə, Qasımlıda, Qaçağanda yaşasa da, o, ömrünün çox hissəsini Ulaşlı kəndində keçirmişdir. Aşıq Məsim də Dollu Əbuzərə məhz Ulaşlı kəndində olan zaman şagird-çıraq olmuşdur.

Gənc yaşlarından çox yaraşıqlı və cüssəli bir aşıq olan Məsim Bəyazidlinin sənətkarlıq məharəti bütün Borçalıya yayılır. O, cavan bir aşıq kimi tez-tez dövrün tanınmış azman sənətkarlı ilə ağır toy-düyün məclisləri aparır. Gözəl qoşquları dillər əzbəri olur. Heç təsadüfi deyildir ki, hal-hazırda da onun yazdığı qoşmalar aşıqların dilindən düşmür. Aşıq Məsim Bayazidlinin ən çox oturub-durduğu yer Tiflisdəki Şeytanbazar məhəlləsindəki draxtınlar olub. Onu da deyək ki, hər aşıq həmin çayxanalarda oxumağa cürət etməzdi. Əgər deyişmədə məğlub olsan, sazın əlindən alınardı, sazın da əldən alınması aşıqlıq etməkdə nə demək olduğunu gözəl bilirik.

Aşıq Məsim Bəyazidli həm də bir çox aşığa ustadlıq etmişdir. Həmin aşıqlardan biri bütün türk dünyasında saz sənətində səs salmış, bu sahədə böyük uğurlar qazanmış Dədə Əmrah olmuşdur.

Oxucular üçün maraqlı olar deyə, Aşıq Məsim Bəyazidlinin Əmrahla ilk tanışlığının necə və harada olmasını və böyük ozanın onu necə şagird götürməsini qeyd etməyi lazım bildik. "...Bir gün Kürüstü Kəpənəkçinin Dərə məhləsində toy idi. Kərimöyündə Dilənin toyuna Borçalının adlı-sanlı sənətkarı ustad Aşıq Məsim Bəyazidli dəvət olunmuşdu. Bunu eşidən balaca Əmrah da toya tamaşa etməyə gəlmişdi. Məclisdə

ağsaqqallar Aşıq Məsimdən xahiş edirlər ki, balaca Əmraha saz çaldırıb onu dinləsin və yoxlasın. Əmrahın çalıb-oxuması ustatdın xoşuna gəlir. Elə həmin toydan sonra Aşıq Məsim Əmrahı şagird götürərək özü ilə bərabər evinə aparır...”

Aşıq Məsim Bəyazidli 1945-ci ildə vəfat etmişdir. Görkəmli ustad haqqında tədqiqat çox azdır. İlk dəfə bu böyük sənətkar haqqında “Borçalı aşıqları” (Bakı, “Nurlan” - 2005) kitabında qısa tərcümeyi-halı və iki şeiri verilmişdir. Daha sonra ustadın adlı-sanlı şagirdi Dədə Əmrahın anadan olmasının 100-illik yubileyi ilə bağlı Tiflisin “Universal” nəşriyyatında (2008) çap olunmuş “Əmrah bir gəldi, bir getdi...” kitabında az-çox, ancaq bir qədər dəqiqləşdirilmiş məlumat verilmişdir.

Aşığın şeirlərini toplamaq, nəşr etdirmək ziyalıların, folklorşünasların borcudur. Sənətkarın şeirlərinin aşıqlarımızın yaddaşlarında və arxivində olduğuna tam əminik. İnanrıq ki, onlar nə vaxtsa üzərə çıxarılacaqdır.

Aşağıda Aşıq Məsim Bəyazidlinin şagirdi Dədə Əmrahın arxivindən götürdüyümüz bir neçə şeiri sizə təqdim edirik.

**Məsim Bəyazidli**

## AMANDI

Başına döndüyüm xanım növcavan,
Mayıl oldum qoşa gözə, amandı.
Gərək bu dostluğu yetirək başa,
Uymuyasan əyri sözə, amandı.

Kərəm kimi mən də sevdim tərsanı,
Gözüm olsun gözləriyin qurbanı,
Yorulmaram sənlə gəzsəm dünyanı,
Kefə gedək bir Tiflisə, amandı.

Elim Borçalıdı, Bəyazid kəndim,
Min gözəl içində səni bəyəndim.
Sən Əslini sevdim, Kərəmtək yandım,
Məsim yazdı vəsfin saza, amandı.

## KEÇDİ

Borçalı elində yol kənarında,
Sallandı qarşımdan yar gəldi, keçdi.
Bircə soruşmadı ərzi-halımı,
Gen dünya başıma dar gəldi, keçdi.

Al-yaşıl geyinib, xınalı dəsti,
Yel vurduqca cığalı telləri əsdi.
Qıyğacı baxışı səbrimi kəsdi,
Çiskinli, boranlı qar gəldi, keçdi.

Aşıq Məsim dərdin, qəmin kanıdı,
Şirin ləblərindən əmən qənidi.
Bir dönüb baxmağın  can dərmanıdı,
Qıymadı qoynundan nar gəldi, keçdi.

## SARVAN QIZI

Nagahdan uğradın qafildan mana,
Sandım ki, ceyransan, a Sarvan qızı.
Qıyğacı baxışın aldı canımı,
Dərdlərə dərmansan, a Sarvan qızı.

Özün çox gözəlsən, həm də innabı,
Sandım ki, üstünə müşkülər yağıb.
İnanmıram səni analar doğub,
Ərşdəki qılmansan, a Sarvan qızı.

Mana irast oldu dəmir yolunda,
Dəftəri, qələmi,  vardı əlində.
İsmi əzbər olub Məsim dilində,
Sazlarda dastansan, a Sarvan qızı.

*İllərin izi var xatirələrdə*



**İlyas TAPDIQ**
**şair, Prezident təqaüdçüsü**

## SÖHBƏT AŞIĞIYDI, SÖZ İŞIĞIYDI...

Hörmətli filologiya üzrə elmlər doktoru, professor İsmayıl Məmmədli və görkəmli alim, filologiya üzrə elmlər doktoru, professor Məhərrəm Qasımlının apardıqları maraqlı verilişdən qənaətim bu oldu ki, ustad aşıqlar demiş "ustad oğlundan şagird olmur", atasının yanında hər şeyi öyrənib bilir, elə birbaşa ustad kimi böyüyür. İsmayıl müəllim də beləcə, atasından, onun yan-yörəsində olan aşıqlardan, aşıqlıq sənətinin bütün incəliklərini öyrənib; aşıq şeirinin əsasını təşkil edən xalq deyim tərzini, sözün hansı məqamda necə işlədilməsini, onun məna və məqsədini dərindən dərk edib.

Aşıq Oruc Əhmədov sadə və aydın danışan, səsinin zili-bəmi yerində olan, atası Vəlidən aşıqlıq öyrənən, dastanları uşaq yaşından sinəsinə köçürən bir aşıq idi. Hay-küydən uzaq, sadəliyi, səmimiyyəti ilə seçilən, "mənəm-mənəmlikdən", yalançı "basıb-bağlamaqdan", "özündən uydurmaqdan" uzaq orijinal bir sənətkar idi. Öyrəndiyini yerli-yataqlı danışan, onu dərin səmimiyyətlə dinləyənə sevgisini, hüsnü-rəğbətini əsirgəməyən kamil bir sənətkar idi. Göyçə mahalının zəngin folklorunun harasından soruşsan dürüst cavab alardın.

Aşıq Orucla 14-15 yaşım olandan tanış idim. O, Gədəbəydə mədəniyyət evinin bir çox tədbirlərində sazıyla-sözüylə alqışlanırdı. Mən məktəbli gənc, şeir həvəskarı kimi rayonumuzun özfəaliyyət baxışlarının iştirakçısı olanda, el şairi Xoşbulaqlı şair Cavadla tanış olmuşdum. Rayonun mərkəzi yolunda şair Cavadla söhbət edəndə Aşıq Oruc ona yanaşıb hal-əhval tutdu. Mən də həmin məqamda Aşıq Orucla görüşdüm.

Aşıq Oruc məndən soruşdu: – Kimin oğlusan? Hansı kənddənsən? – Əlismayıldanam, dedim. (indiki Alnavat). Orucun oğluyam....

Aşıq Oruc güldü. Kəndimizdə Namazoğlu Əlinin oğlunun, Hertalı nəvəsi Cavadın oğlu Cahangirin və başqalarının toyunu apardığını dedi. Yəqin məni o toylarda görmüsən?

Dedim ay Oruc qağa, sizi bütün kənd tanıyır. Bizim arançı qonaqlarımız biz yaylağa gələndə sizdən söhbət salıb, sizi o ki var tərifləyib! Mən kəndimizdə etdiyiniz toylarda sizə əl çalıb alqışlayanlardan olmuşam. Tez-tez evimizin yanından keçəndə dəmirçi Mərdəli kişiylə söhbət edib zarafatlaşırsız. Onun ən çox sevdiyi aşıqsız!

On-on beş gün bundan qabaq idarənin yanında dəmirçi Mərdəli nal kəsib atını da nalladı. Bazar günüydü. Mən də Mərdəli kişinin körüyünü basırdım.

Qonşumuzdu, iş görəndə, körüyü yorulana qədər bizə basdırır!

Aşıq Oruc mənim sözlərimə gülüb, şən oldu. Bəs bu Cavad əmiylə hardan tanışsan?

Dedim:

– Cavad əmiylə qəzet redaktoru Əmiraslan Nuriyevin yanında tanış olmuşam. Əmiraslan müəllim "Sosializmin qələbəsi" (indiki "Tərəqqi" qəzeti onda belə adlanırdı) rayon qəzetinin redaktorudur. Şair Cavadın şeirini çox xoşlayır. Onun Aşıq Teymura yazdığı "Bir zədən bulaqsan, selə sataşa" şeirini də əzbər bilirəm...

Aşıq Oruc həmin şeiri toylarda tez-tez oxuduğunu dedi: – Elə toy olmaz ki, onu mənə oxutmasınlar! Teymur Misginli Məsimlə bu şeiri çox oxuyur. Sifarişinə də hər dəfə bir onluq alır!

Şair Cavad dedi: Aşıq Teymur zarafatdan incimir. Bu şeiri onun özünə də oxutdururdular.

Sonra da Cavad qağa Aşıq Teymurun "Bizim arvad" şeirindən iki bəndi əzbər dedi:

*"Ay mən günlü qardaş, arvadı zalım,*
*Deyirsən yamandı, boz bizim arvad,*
*Qış olanda durmur peçin yanından,*
*Tapılmır evdə də yaz bizim arvad!*

Biz gülüşdük, Cavad bir az fikirləşib, o biri bəndləri demək istəyirdi. Aşıq Oruc o biri bəndi özü əzbərdən məzəli bir şəkildə söylədi:

*Aşıq Teymur, düşmə eşq həvəsindən,*
*Aralı gəz arvadların nəslindən!*

*Sübhə kimi yatammıram səsindən,*
*Edib qulağımı kar bizim arvad!..*

Cavad qağa: “ay sağ ol!” – dedi.



Aşıq Oruc haqqında ilk təəssüratım o gün elə-belə oldu. Bu əhvalatı əmim oğlu şofer İsaya danışdım. Həmin şeiri Oruc qağadan alıb o da əzbərlədi… O vaxtdan illər keçdi. Bakıda tələbəlikdən sonra nəşriyyatlarda işlədim, radiokomitəyə də gedirdim. Bir gün radiokomitədə Oruc qağa ilə görüşdüm. Səsini yazdırmağa gəlmişdi. Mən o vaxt Aşıq Əmrahı, Kamandarı, Aşıq İmranı, Əkbəri yaxşı tanıyırdım. Dağüstü parkda gədəbəyli alim dostum Qəzənfər Quliyevin həyat yoldaşı Liza xanım parkın yay konsert zalında mənə aşıqlarla görüş keçirməyi təklif etmişdi. Aşıq Teymur, Aşıq Oruc, İmran, Əkbər, Aşıq Pənahla görüşlər keçirdik. Mən aparıcı oldum.

Rayonumuzun deputatı hörmətli Teymur Əliyevin (Allah rəhmət eləsin) kitabının redaktoru (o vaxtlar radiokomitənin sədri Teymur Əliyev idi) Bakıda gördüyüm aşıqları Teymur müəllimin yanına gətirməyi, onların səsyazma studiyasında yazılmasına köməklik göstərməyi ştatdankənar müxbir kimi, “bir aşığa az-çox bələd olan adam kimi” mənə həvalə etmişdi.

Aşıq Orucu da həmişə məndən soruşurdu. Rayonumuzda da deputat seçiləndə təntənəli gecədə Aşıq Orucun oxumasını eşitmiş və çox xoşuna gəlmişdi. Teymur müəllim Aşıq Orucu ədəb-ərkanlı, gözəl səsi və söhbəti olan aşıq kimi görmüşdü və studiyaya dəvət edib, Aşıq Ələsgərin “Gördüm” rədifli qoşmasını “Qaraçı” (“El havası” da deyirlər) havası üstündə yazıya aldırmışdı. Bu ifa Aşıq Orucu geniş dinləyici kütləsinin ən sevimli aşığı kimi tanıtmışdı.

Aşıq Oruc Gədəbəyin Zəhmət kəndində yaşayırdı. Onu uğursuz zob xəstəliyi tutmuşdu. Buna görə də müalicədə çox olurdu. Daha məclislərə, ictimai yerlərə az gəlib-gedir, müalicəxanalarda vaxt itirirdi. O vaxt radioda onun 30-dan çox havanı yazdırması Aşıq Orucun çox cavan sənətinin sevildiyinin sübutu idi. Daha da kamilləşdiyi bir vaxtda dünyasını dəyişməsi isə onu tanıyanları, əzəmətli, ecazkar səsinin həsrətini çəkənləri bərk kədərləndirirdi.

İndi görkəmli dilçi alim, professor İsmayıl Oruc oğlu ilə hər dəfə qardaş kimi görüşüb atası Aşıq Oruca, 1941-1945-in odlu cəbhəsində dünyasını dəyişən atam Oruca Allahdan rəhmət diləyirəm. Bu hisslərimi "Atamın son məktubu" və Aşıq Oruca həsr etdiyim şeirimdə əks etdirməyə çalışmışam. "Atamın son məktubu"nu 1952-ci ildə yazmışdım. Aşıq Oruca həsr etdiyim şeiri isə görkəmli alim Məhərrəm Qasımlının "Mədəniyyət" kanalında apardığı və İsmayıl Oruc oğlunun da qonaq olduğu verilişə baxa-baxa yazmışam.

### Qardaşım İsmayıl Oruc oğluna

Sənət yurdu, söz beşiyi Göyçənin
Bir oğlu da Gədəbəydə ucaldı.
El xidməti, el sənəti seçənin
Zəhmətindən Zəhmət kəndi güc aldı.

Aşıqlıq da bir ilahi sevgidi,
Gərək can qoyasan saza, hər sözə.
Bu sənətin Oruc oğlu mərd idi,
Onunçün dönürdü gecə gündüzə!

Öz dərsini ustadlardan almışdı,
Sinəsində xəzinəsi var idi.
Yurd-yuvanı Zəhmət kənddə salmışdı,
Qaynar bulaq kimi səsi var idi!

Aşıqlıq sənəti elinə borclu,
Gəncliyindən məclis yaraşığıydı.
Görmədim heç yerdə onu forslu,
Söhbət aşığıydı, söz işığıydı.

Əziz qonağıydı dağ kəndlərinin,
Aran məclisi də tapırdı onu.
Önə çəkməz idi heç vaxt xeyrini,
Bəzən gur məclislər yorurdu onu!..

Dinə etiqadı, inamı vardı,
Sözü könül açan, səsi fəyyazdı.
Orucluq ayında oruc tutardı,
Divardan asardı, sazı çalmazdı.

Bilirdi qədrini ulu sənətin, –
Sazı dost yolunda ərməğan idi.
Eldə unudulmaz sözü-söhbəti,
Övladına qalan – adı-sanıdı!

Yaddan çıxarmadı Vəli* dərsini –
Ondan söz açardı, bulaq başında.
Onun məclisinin, onun səsinin
Heyranı olmuşdum, cavan yaşımdan.

Bir saz məclisinə yolum düşəndə
Bir aşıq ordusu keçir gözündən.
Oğlun İsmayılla mən görüşəndə,
Sanki əyləşirik ata dizində.

Ata Oruclar** da görüşür sanki,
Onlar bir-birinin əlini sıxır.
Biri məclislərdən, biri döyüşdən
Mərdliklə boylanır, zəfərlə çıxır...

Ata adlarıyla fəxr edirik biz,
Ata ləyaqətdi, ata hünərdi!
Budur övladlara istəklərimiz –
Ata vüqarıyla gəzsin hər yerdə!



---

* *Atası, həm də ustadı*
** *Mənim də, İsmayılın da atasının adı Orucdur*

Aşıq Oruc ƏHMƏDOV

## NEYLƏSİN

Öz eybini bilməzlərə
Qohum-qardaş, el neyləsin.
Zatı xayın olan kəsə
Düzgün ürək, dil neyləsin?

Elmə sinə gərməyənə,
Ustad dərsi görməyənə,
Düzə qiymət verməyənə,
Alim, şair bil, neynəsin?

Eli sevər ər oğlu ər,
Qanı təmiz, canda hünər.
Haqsız ölsə, nadan, sərsər,
Ona külüng-bel neyləsin?

Sarvan ümid bağlar nərə,
Şair olan şah əsərə.
Səyyah yorğun, çətin bərə,
Ovun getsə, sel neyləsin?

Aşıq Oruc, de sözünü,
Tərifləmə gəl özünü.
Bil, çevirsə el üzünü,
Yüz köməkçi əl neyləsin?

## VAR

Özgənin bağına həsrət deyilik,
Bizim könül açan öz bağımız var.
Tamarzı deyilik nara, heyvaya
Onu yetişdirən torpağımız var.

Əllərdə dalğalanır sülhün bayrağı,
Bizimdir həyatın gözəl növrağı.

Göz üstə saxlarıq gələn qonağı,
Gəzməyə minlərlə yaylağımız var.

Qəhrəman yurdudur mənim bu yurdum,
Poladdan möhkəmdir, yenilməz ordum.
Aşıq Oruc deyər, hər kimdən sordum
Dedi: bundan gözəl sabahımız var.

## DANIŞAQ

Aşıq, gəl götürək sədəfli sazı,
Azad eldən, bu diyardan danışaq.
Boranlar əlindən almışıq yazı,
Ürək açan gülüstandan danışaq.

Dağların döşündən təzə yol çəkən,
Şoranlı çöllərə gül-çiçək əkən,
Göylərə baş vuran binalar tikən
Saf ürəkli, mərd insandan danışaq.

Aşıq Oruc, Vətənindən ilham al,
Götür telli sazı, bas bağrına, çal.
Qoçaq insanları daim yada sal.
Hər məclisdə qəhrəmandan danışaq.

## SƏNİN

Azərbaycan, mənim qəhrəman yurdum,
Nə gözəl qurulub dövranın sənin.
Cərgə-cərgə şəhər, kəndin görəndə,
Sanki bir cənnətdir hər yanın sənin.

Ölkəmdə beysavad de, kim qalıbdır?
Elm dəryasına hamı dalıbdır.
Müdriklərdən tərbiyəsin alıbdır,
Mərifət əhlidir insanın sənin.

Mədəniyyət artıbdır, şən gün keçirik,
Firavan həyata biz də gedirik,
Bu azad ölkəmdə şövqü edirik,
Oruc da söylüyər bəyanın sənin.

*Aşıq Məmmədağa BABAYEV - 80*

**Seyfəddin QƏNİYEV**
professor



# AŞIQ MƏMMƏDAĞANIN YARADICILIĞINDA KAMİL İNSAN OBRAZI

XX əsrin 50-ci illərindən sonra Şirvan aşıq mühitinin inkişafı, təbliği və genişlənməsində bir çox görkəmli sənətkarlar – Aşıq Qurbanxan, Aşıq Abbas, Aşıq Bəylər, Aşıq Əhməd, Aşıq Şakir, Aşıq Şamil, Aşıq Barat, Aşıq Pənah, Aşıq Xanmusa, Aşıq Xanış, Aşıq Şərbətlə yanaşı Aşıq Məmmədağanın da xüsusi xidmətləri olmuşdur. Aşıq Məmmədağanın həyat və yaradıcılığı haqqında bir çox alim və ziyalılar tədqiqatlar aparmış, dəyərli fikirlər söyləmiş və şeirlərini çap etdirmişdir. Bu baxımdan Ə.Cəfərzadə, Q.Namazov, E.Məmmədli, S.Qəniyev, V.Yusifli, İ.Etibar, Ə.Sailov və başqaları müxtəlif səpkili məqalələr, oçerklər yazmışlar.

Aşıq Məmmədağa Ağaxan oğlu Babayev 1933-cü ildə Şamaxının saz, söz ocaqlarından biri sayılan Cəyirli kəndində dünyaya göz açmışdır... Onların ailəsi bir müddət sonra Şamaxı şəhərinə köçmüşdür. Məmmədağa orta təhsilini Şamaxıda almışdır. Gənc yaşlarından aşıq yaradıcılığına rəğbət bəsləyən Məmmədağa ulu sənətin sirlərini Şirvan aşıq mühitinin dədə sənətkarı sayılan ustad Aşıq Mirzə Bilalın şagirdi Aşıq Abbasdan almış, onun məsləhətləri, öyüdləri və tələbləri sayəsində müqtədir aşıq səviyyəsinə yüksələ bilmişdir. Ötən əsrin 50-ci illərinin sonunda sərbəst aşıq kimi fəaliyyətə başlayan sənətkar tez bir zamanda təkcə Şirvan mahalında deyil, Azərbaycanın digər bölgələrində, eləcə də Dağıstanda, Gürcüstanda da sevilmiş və məclislərə dəvət olunmuşdur. Ötən əsrin 70-ci illərindən sonra keçmiş sovetlər birliyinin bir çox şəhərlərində, o cümlədən, Moskva və Leninqradda, eləcə də Orta Asiyada keçirilən festival və müxtəlif səpgili tədbirlərə qatılmış, doğma Azərbaycana təltiflərlə – mükafat, medal və fəxri fərmanlarla dönmüşdür.

XX əsr Şirvan aşıq mühitinin ünlü sənətkarı Aşıq Məmmədağa – bülbül ləhcəli xanəndə, bəstəkar, sair, sərraf natiq ömrünün və yaradıcılığının çiçəkləndiyi bir vaxtda – 1977-ci il noyabr ayının 22-də dünyasını dəyişmiş, böyük satirik şair M.Ə.Sabirin uyuduğu “Yeddi Günbəz” qəbirstanlığında dəfn olunmuşdur.

Aşıq Məmmədağa yaradıcı sənətkar olmuşdur. Aşıq şeirinin demək olar ki, bütün şəkillərində qələmini sınamış və kamil sənət inciləri yaratmışdır.

Aşıq Məmmədağanın yaradıcılığı üçün xarakterik olan motivlərdən biri mənəvi-əxlaqi dəyərlərin tərənnümü, xeyirin, haqqa, ədalətə xidmət edən dəyərlərin təsdiqi, şərin isə inkarıdır. Sənətkar bu məsələdə milli ənənələrdən çıxış etmişdir. Yəni o, istər bir insan, istərsə də bir aşıq kimi bütün hallarda ənənənin varisidir. Bu ənənə isə xeyir-şər modeli üzərində qurulmuşdur.

Sənətkara görə, insanın xisləti dünyanın ilahi quruluşunu özündə əks etdirir. Uca Allah varlıq aləmini xeyirin və şərin, yaxşılığın və pisliyin vəhdətində qurmuş, xeyiri və yaxşılığı uca əməl kimi yaratmışdır. Aşıq bir çox şeirləri ilə yanaşı, «Əyilməz namərdə, yada yaxşılar» şeirində deyir:

*İnsan xislətində əzəl binadan,*
*Ucada dayandı, durdu yaxşılar.*
*Haqqın dərgahında hər bir əməldə,*
*Zülmətdə yamanlar, nurda yaxşılar.*

Göründüyü kimi, şeirdə yaxşı-pis, mərd-namərd qarşıdurması əsasdır. Təhlil sənətkarın yaxşı insan modelinin əsas kefiyyətlərini görməyə imkan verir. Aşığa görə:

– ***Yaxşı o kəsdir ki***, dərdə yanır, başqalarına qarşı həssasdır. İnsanlıq halına biganə deyildir: birinin üzündən oxunan dərdlərini heç vaxt görməməzliyə vurmur və bu cəhətləri ona hörmət, ad-san qazandırır.

– ***Yaxşı o kəsdir ki***, çörəyini Allah rizasına başqaları ilə bölür. Ürəyində xalq qeyrəti, qolunda hər zaman xalq yolunda işlənən qüvvət var. O, el yolunda xeyirxah işlər görür və heç vaxt namərdə, yada əyilmir.

– ***Yaxşı o kəsdir ki***, hər bir tikəsini halal yeyir. Nankorların halal tikəyə göz dikməsinə heç vaxt imkan vermir. Özünü dost yolunda oda yaxır və yaxşı dost üçün hər zaman qanından keçməyə hazırdır.

– ***Yaxşı o kəsdir ki***, yaxşılıq beləsinin qanında, canında, ruhunda, sümüyündə, iliyindədir.

Öz ömrü çərçivəsində bu dünyanı təcrübə eyləmiş Aşıq Məmmədağa həyatın hər bir üzünü görmüşdür. Lakin onun gördükləri yaddaşında sadəcə bir xatirə kimi qalmamış, hər gördüyündən bir nəticə çıxarmışdır. Sənətkar «Bilər» rədifli şeirində öz həyat təcrübəsini müasirləri ilə bölərək onlara ləyaqətli olmağı, pisliklərdən qurtulmağı nəsihət edir. Aşığa görə, insan bütün bunları öz təcrübəsində yaşamalıdır. Öz ləyaqətini özü qorumağı bacarmalı, pis adətlərdən, mənfi keyfiyyətlərdən özü qorunmalıdır. Çünki cərrah bir yaranın nə olduğunu özü əməliyyat aparmasa bilmədiyi kimi, insan da öz dərdinə özü vaqif olmalıdır:

*Bacar özün qoru ləyaqətini,*
*Tərgit gəncliyində pis adətini.*

Müəllifə görə, axtarmaq, öyrənmək, daim bilik kəsb etmək insan oğlunun xislətindədir. Bütün bəşər övladının həyatı, əslində, bir səyyahın dünyanı gəzməsi kimi bilik öyrənməsidir. Bilik təkcə məktəbdə öyrədilmir. Həyatın özü ən böyük məktəb və müəllimdir. İnsan Həyat adlı məktəbi bütün ömrü boyu oxumalıdır. Ancaq bu məktəbdə heç vaxt nadanla – biliksizlə yoldaşlıq etmək olmaz. Çünki bu məktəb insanlarla sirdaşlıq – yoldaşlıq tələb edir. Nadanla yoldaşlıq edən yarı yolda qalar:

*Bəşər bu dünyaya gələndən bəri,*
*Səyyah tək axtarır, öyrənir yeri.*
*Ürəkdə gizlənən bir gizli sirri,*
*Elə zənn etmə ki, hər nadan bilər.*

İnsan öz təcrübəsindən öyrənir. Həyatın hər addımı təcrübədir. Aşıq Məmmədağa bu mənada insanın yaşadıqlarını bir təcrübə – eksperiment hesab edir. Yəni bir alim əvvəlcə təcrübə aparıb sonra onun nəticələri üzərində düşündüyü kimi, insan da etdiyinin üstündən ötüb keçməməli, ovçu boş gülləni səhv atdığını, alim bir yenilik yaratdığını əvvəl dərk etməyib sonradan nəticə çıxardığı kimi, insan da hər addımının nəticəsini həyat təcrübəsinə çevirməlidir:

*Ovçu boş gülləni səhv atdığını,*
*Qəm-qüssə insanı qocaltdığını,*
*Alim bir yenilik yaratdığını,*
*Əvvəlcə dərk etməz, sonradan bilər.*

Aşıq Məmədağa bəyan edir ki, insan ömrünün bütün qayəsi öz gücünü, qüvvətini, ağlını, hünərini vətən yolunda sərf etməkdən ibarət olmalıdır. Yalnız bu halda onun ömrü mənalı ömür sayıla bilər. Lakin insanın qəlbinin vətən üçün döyünməsi nə qədər əsas olsa da, təkcə bununla kifayətlənmək olmaz. İnsana vətənə xidmət etmək üçün həm də ağıl, bilik lazımdır. Bu mənada pis ilə yaxşının yerini tanımaq, onları fərqləndirmək və onların təbiətinə uyğun davranmaq insanın borcudur:

*Vətənçün sərf eylə öz hünərini,*
*Pis ilə yaxşının tanı yerini.*
*Məmmədağa sənin ürək sirrini,*
*Üzünü görməsə, haradan bilər.*

Sənətkarın bir çox şeirləri aşıqlığın mənəvi-əxlaqi keyfiyyətləri ilə bağlıdır. Sənət meydanına təzəcə gələn elə insanlar olur ki, yetişməmiş, bişməmiş, bərkiməmiş meydanalara atılır, sənətin sirlərinə vaqif olmamış böyük ustadlarla üz-üzə gəlməyə çalışır. Aşıq Məmmədağa belələrini **xam – kal** hesab edərək onlarla qarşılaşmır, əksinə, həyat və sənət həqiqətlərini başa çalıb, doğru yola yönəltməyə çalışır. «Bəhsə girmə mənimlə» rədifli şeiri bu qəbildəndir:

*Oğlan, xamsan, get ustaddan dərsini al,*
*Ağıllı ol, bəhsə girmə mənimlə.*
*Aşıqlığa çox tələsmə, aram ol,*
*Ağıllı ol, bəhsə girmə mənimlə.*

Bu, şeir poetik ənənə baxımından Dədə Ələsgərin aşıqlığın tərifindən bəhs edən "Gərəkdi" rədifli qoşmasına bağlıdır. Ələsgər bu şeirdə aşıqlığın, bir növ, "qızıl qaydalarını" bəyan etmişdir. Həmin "qaydaları" şərh edən İ.Ağazadənin yazdığı kimi, "aşıq" olanın ilk əsas mentalitet dəyəri onun ədəb sahibi, mərifət sahibi olmasıdır. Əgər aşıqda ədəb, mərifət, qanacaq, qabiliyyət dəyərləri olmasa, o, el içində baş çıxara bilməz. Əsl aşıq həqiqətpərəst olmalı, doğruluq, düzgünlük kimi dəyərlərə sahiblənməlidir. Buna gedən yolun özü də başqa mənəvi dəyərlərlə bağlıdır. Belə ki, aşıq həqiqət carcısı olub, insanlara həqiqətdən, doğruluq-düzgünlükdən danışmaq və onları özünə inandırmaq üçün özü ilk növbədə nəfs, tamah kimi mənfi mentalitet sifətlərindən uzaq olmalıdır. Bu halda onun mənəvi simasını səciyyələndirən ən böyük dəyər paklıq, saflıq, təmizlik olmalıdır. Aşıq ədəblilik, paklıq, saflıq kimi dəyərlərin sahibi olandan sonra onun danışdığı sözlər ləl-gövhər kimi

qiymətli olur. Başqa sözlə, insanın sahib olduğu müsbət mentalitet dəyərləri onun qəlbini paklıq mücəssəməsinə çevirir və bu halda danışdığı sözlər də bir güzgü kimi bu paklığı əks etdirir. Ələsgərin poetik idealına görə, aşığa şərm (xəcalət), həya, abır kimi sifətlər də xas olmalıdır. O, haqqsevər olmalı, doğruluq onun həyat idealı sayılmalıdır. Bu kimi sifətlərin (mentalitet dəyərlərinin) sahibi olan aşıq (insan) Allahın sevimli bəndəsinə çevrilir və Uca Yaradandan dünyanı bəsirət gözü ilə görmək, başqalarının adi gözlə görə bilmədiklərini görüb anlamaq qabiliyyəti alır.

Aşıq Məmmədağanın da "Bəhsə girmə mənimlə" şeirini təhlil etdiyimiz zaman görürük ki, o, mənəvi ustadı Ələsgərin "Gərəkdi" şeirindəki "qızıl qaydaları" mənimsəyib özünün sənət və həyat kredosuna çevirməklə bərabər, bunları öz yaradıcılığının ilham mənbəyinə çevirmişdir. Bu cəhətdən Aşıq Məmmədağaya görə:

– "Boğulmamış yabıdan" köhlən olmadığı kimi, xam aşıqdan da ustad olmaz. Məmmədağa özü balabançı Kalvalı Əli Dədədən, Dədə Bilalın oğlu Aşıq Ağalar, Aşıq Abbasdan dərs alaraq ustad məqamına yüksəlmişdir. Bu mənada sənətkarlığın – ustadlığın yolu öyrənməkdən, sənət yolunda hər cür əzab-əziyyətlərə qatlaşa bilməkdən keçir.

– Sənətkarlıqda kamilləşməmiş aşıq tələsib ustad meydanına çıxsa, uğursuzluğa düçar olar. Necə ki, atalar demiş, "yabı yol gedəndə nalı tökülür". Sənətini kamilləşdirməmiş aşıq da bu yolda öz "nalını tökəcək" – ustad aşıqlar qarşısında büdrəyəcək.

– Özünü aşıq, ustad adlandırmağa tələsənlər sazı hörmətdən salır, sözün siqlətini azaldırlar. Aşıqlıq sənəti müqəddəsdir. O, milli dəyərlərin alınmaz qalasıdır. Xam aşıq, naşı sənətkar təkcə özünə ziyan etmir, ustad aşıqların müqəddəs əmanəti olan sənət qalasına da «rəxnə vurur». Məmmədağa belə düşünürdü...

Aşıq Məmmadağa belələrini onunla bəhsə girməkdənsə, ondan öyrənməyə çağırır. Çünki o, heç vaxt boş və yalançı təriflərə uymamış, sənətdə hansı mərtəbəyə qalxıb-qaxmadığını öz ağlı, huşu ilə müəyyən etmişdir:

*Məmmədağa boş tərifdən uzaqdır,*
*Əqli, huşu sənətinə dayaqdır.*
*Sən ki xamsan, yaşın hələ uşaqdır,*
*Ağıllı ol, bəhsə girmə mənimlə.*

Aşıq Məmmədağa hər nə qədər böyük ustad olsa da, özünü bütün ömrü boyu gerçək və mənəvi ustadlarının yanında şagird saymışdır. Bu

cəhətdən o, Dədə Ələsgəri, Aşıq Daşdəmir, Aşıq Nurəddin, Dədə Bilal və b. özünə mənəvi ustad saymışdır. Böyük ustada həsr etdiyi şeirində göstərir ki, aşıqlığın bütün sirrini Ələsgər açıb dünyaya car etmiş, sözün sehrini ilk dəfə, o üzə çıxarmışdır. Ələsgərin düzdüyü sözlər inci, sədəf olmuşdur. Ələsgər bu məqama əhli-hal olduğu üçün çatmışdır. Məmmədağa nə qədər ömür yaşayırsa, Ələsgərdən dərs almaqda davam edir. Çünki aşıq olan bu amalla ucalmalıdır. Ələsgər bir xəzinədir; sənətin, sazın, sözün yolu ondan keçir:

*Aşıqlıq sirrini o açdı bizə,*
*Bizi bələd etdi sehrli sözə,*
*İncidən, sədəfdən söz düz-düzə,*
*Aləm bildi, əhli-haldı Ələsgər.*

*Məmmədağa Ələsgərdən dərs alır,*
*Aşıq olan bu amalla ucalır,*
*Fəhm eləyin, ay cavanlar, qocalır,*
*Xəzinədir cah-cəlaldır Ələsgər.*



*Aşıqlarımızın yaradıcılığından*

**Aşıq İmran HƏSƏNOV**



## GƏTİRİR

İnsan fəsillərin timsalındadı,
Adam var çovğunu, qarı gətirir.
Ayağı ruzili, başı dövlətli,
Adam var neməti, varı gətirir.

Adam var günəş tək zərif şəfəqli,
Elinə arxalı, min bir diləkli.
Adam var sayılır dosta gərəkli,
Adam var ki, ilk baharı gətirir.

Nərdən nər törəyər, köhləndən bədoy,
Bədəsildən gözlənilməz əsil-soy.
Aşıq İmran, çox eyləmə götür-qoy,
Mərd igid namusu, arı gətirir.

## BAĞLIYAM

Vətən nəfəsilə nəfəs alıram,
Sazımla, sözümlə elə bağlıyam.
Arzum bu ellərə şadlıqdır mənim,
Qüssələr dağıdan telə bağlıyam.

Şadlıq dünyasında mayalanmışam,
Azadlıq eşqiylə sayalanmışam.
Yaxşılıq oduyla daim yanmışam,
Nə fitnəyə, nə də felə bağlıyam.

Səfa üçün hər cəfaya dözmüşəm,
Xoş niyyətlə hər diyarı gəzmişəm.
Həqiqətə şeir, dastan yazmışam,
İmranam bülbültək gülə bağlıyam.

## GEDİR

Gününü mənasız keçirmə, dostum,
Hər anın mənası ömürdən gedir.
Yığaq qəlbimizə eşqi, inamı,
Hər gedən dəqiqə səbirdən gedir.

Qaydadır ki, insan çəkər əslinə,
Əsli olan ləkə vurmaz nəslinə.
Könül uçur bir gözəlin vəslinə,
Söhbət ürəkdəki əmrdən gedir.

Xeyri yox qanmaza ha yalvar, ləli,
Axırda bürüncə dəyişər ləli.
Dəmirçi ha döysün, ağrımaz əli,
Ancaq nə gedirsə, dəmirdən gedir.

**SORUŞUN**

Dilin fəziləti üz ağlığıdı,
Ürəyin hökmünü dildən soruşun.
Fəsil tək ayrıdı əməllərimiz,
Yaxşını, yamanı eldən soruşun.

Həqiqət yenilməz, nə olmaz naçar,
Böhtandan, şayədən haqq özü qaçar.
Sözün gerçəyini zarafat açar,
Ya ürəkdən, ya könüldən soruşun.

Vaxt gələr ki, aşıq İmran köçərsən,
Haqq yanında imtahandan keçərsən.
Nə əkmisən bil onu da biçərsən,
Eyliyi, səxanı eldən soruşun.

**NƏ XEYRİ VAR Kİ**

Dost-düşman yanında dərdini açıb,
Hər sözü deməyin nə xeyri var ki.
Keçirdin vədəni geri qayıtmaz,
Göz yaşı tökməyin nə xeyri var ki.

Vətən deyib bir meydana girməyən,
Məna axtarmayan, məna bilməyən.
Məqamında bir iş görə bilməyən,
Diz üstə çökməyin nə xeyri var ki.

Ay İmran, yaxşılıq, yamanlıq ölməz,
Qartal yuvasında sağsağan ötməz.
Yüz ağlamaq bir qəddarı kövrəltməz,
Boynunu bükməyin nə xeyri var ki.

**XOŞ VÜSALDI**

Həyat qanadlıdı, insan piyada,
Kimi çalır, kimi yarı yoldadı.
Dövran etibarlı, ömür vəfasız,
Dünyanın ləzzəti xoş vüsaldadı.

Bu gözəl dünyanın vurğunuyuq biz,
Yaşamaq olarmı duyğusuz, hissiz.
Nadanlar dünyadan köç eylər izsiz,
Duyub dərk eləmək pürkamaldadı.

İmran aşiq olub bir təmiz ada,
İnan, ömrü boyu baş əyməz yada.
Bircə yaxşılıqdı qalan dünyada,
Yaxşılıq adəti əhli-haldadı.

**ƏDALƏTLİ OL**

Ədalıq eyləmə ellər içində,
Təmiz arzulu ol, saf niyyətli ol.
Şərdən uzaq dolan, fitnədən kənar,
Böyükdən alqış al, ziyarətli ol.

Qılıncdan itidir sözün kəsəri,
Tarix unudarmı zərli əsəri.
Arzuyla aç hər açılan səhəri,
Qəddarlıq eyləmə, ədalətli ol.

Qoy izin getməsin vətən mülkündən,
Sözlərin düşməsin xalqın dilindən.
Aşıq İmran, ilham alıb elindən,
Sənət meydanında şərafətli ol.

**YAŞADAR MƏNİ**

Pak ürəyim, təmiz qəlbim, vicdanım,
Elimin gur səsi yaşadar məni.
Sənətim həqiqət, sözüm azaddı,
Babalar nəfəsi yaşadar məni.

Gözümdə kölgə yox, qəlbimdə ləkə,
Gətirmir başıma min cür təhlükə.
Taledən istərəm bir halal tikə,
Ustadlar kəlməsi yaşadar məni.

Ömrümü vermədim yelə, hədər,
Eşqim ümman olub, dönüb Xəzərə.
İmranam, xalqımın böyük zəfərə,
Tükənməz həvəsi yaşadar məni.



*Altay Ələddin oğlu Məmmədli 1972-ci ildə martın 7-də Gədəbəy rayonunun Düzrəsullu kəndində anadan olub. 1989-cu ildə orta məktəbi bitirib, 1990-1992-ci ildə hərbi xidmətdə olub.*

*1994-cü ildə Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin "Bədii xalq yaradıcılığı" fakültəsinə daxil olub, 1998-2000-ci illərdə isə magistratura pilləsində təhsil alıb. 2000-ci ildən AMEA Folklor İnstitutunun "Aşıq yaradıcılığı" şöbəsində elmi işçi kimi fəaliyyət göstərir.*

*Dünyanın 20-dək ölkəsində beynəlxalq folklor festivallarında respublikamızı ləyaqətlə təmsil edərək diplomlara layiq görülüb.*

**Aşıq Altay MƏMMƏDLİ**

**GƏLİBSƏN**

Özün nursan, adında nur sözü var,
Günəşdən süzülüb, Aydan gəlibsən.
Aləmi mat qoyan pərilər kimi,
Dəryadan yaranıb çaydan gəlibsən.

Xəyalımda bağçalardan dərdiyim,
Əzizləyib sinəm üstə sərdiyim,
Kimsədə görünməz səndə gördüyüm,
Qız, hansı nəsildən, soydan gəlibsən.

Büllur bədəninə tül bürünürsən,
Özün gülsən yenə gül bürünürsən.
Altayın gözündə zər görünürsən,
Elə bil təzəcə toydan gəlibsən.

**DÜNYADI**

Bu dünya vəfasız deyildir məncə,
Bizə öz qoynunu açan dünyadı.
Ulduz öz işində, Ay öz işində,
Günəşi əbədi saçan dünyadı.

Bəlkə də bir candı, canın içində,
Biz də varıq bu cahanın içində.
İşə bax ki, bircə anın içində,
İnsan oğlu qoyub qaçan dünyadı.

Özü bilir, yaxşı qurub işini,
Bizə ləng göstərir öz gərdişini.
Qorxunc əjdahanın çəkib dişini,
Qanlı guzələrlə içən dünyadı.

İnsan özü pozur öz nizamını,
Çəkir dirəyini, yıxır damını.
Bəzən şah eyləyir bir haramını,
Kim deyir ki, şahlar seçən dünyadı.

Göylər sonu çox dərindir, görünməz,
Tanrının işidir, sirri bilinməz.
Altay deyər, yaxşı-yaman silinməz,
Dərgahında ruhlar uçan dünyadı.

**BAŞQADI**

Qəlbim atəş görüb, qəlbim od görüb,
Sən çatan ocağın közü başqadı.
Çox ala gözlüyə dastan deyiblər,
Mən heyran olduğum gözü başqadı.

Gah enişdən, gah yoxuşdan sormuşam,
Özümü arana, dağa vurmuşam.
Bərə tutub kamanımı qurmuşam,
Ceyran yerişlimin düzü başqadı.

Bir gözəl əlindən içdiyim camın,
Duyuram həsrətin, dadıram tamın.

Altaya göylərdən gələn ilhamın,
Söhbəti başqadı, sözü başqadı.

## GÜNDÜZ

Bu illər boyunca mərd gördüm səni,
Dostluğun sarsılmaz qalası, Gündüz.
Çətinə düşəni, dara düşəni,
Olursan tufandan alası, Gündüz.

Böyük ürəyinnən, halal varınnan,
Bütöv söhbətinnən, düz ilqarınnan,
Özü başda igid, nər dostlarınnan,
Adını dastana salası Gündüz.

Yaxına buraxmaz fitnəni, fəndi,
Lələ qiymət verər Altayın zəndi.
Atası Mehtidi, Dörddərdi kəndi,
Şınığın vüqarlı balası Gündüz.

## QALIBDI

Gün keçibdi, ay keçibdi, biləsən,
Baxışların gözlərimdə qalıbdı.
Əhvalımdan xəbərsizsən hələ sən,
Baxışların gözlərimdə qalıbdı.

Gözəllərin çox olubdu xatası,
Neçə qəlbin üstə ocaq çatası.
Günahsızam, inan mənə, qadası,
Baxışların gözlərimdə qalıbdı.

Günəş kimi şəfəqlərin varıydı,
Buxağın ağ, biləklərin qarıydı.
Göz piyalə, ipək tellər sarıydı,
Baxışların gözlərimdə qalıbdı.

Bu nə sirdi məni bel oxudan,
Doymaq olmur bu ətirdən, qoxudan.
Bir sübh çağı oyandım ki, yuxudan,
Baxışların gözlərimdə qalıbdı.

## GƏLDİ

Xəyalım yenə də pərvaz eylədi,
O günəş şölənə pərvanə gəldi.
Hüsnünün vəsfini söyləmək üçün,
Yüz dastan yarandı, yüz xanə gəldi.

Dönə bilsəm tellərinin çətrinə,
Əzizlərdim, toxunmazdım xətrinə.
Bələnəydim nəfəsinin ətrinə,
Duyaydım meh əsdi, xoş nanə gəldi.

Dərəydim çiçəyi qönçə bağından,
Üzəydim meyvəni qoşa tağından.
Bir busə alaydım bal dodağından,
Deyəydin Altaydan nişanə qaldı.

## GƏLMƏDİN

Gen günün aşnası, indi yaxşıyam,
Yamanca düşmüşdüm dara, gəlmədin.
Bir ovuc suyunun möhtacı idim,
Alışıb yanırdım nara, gəlmədin.

Yarıya bölərdim nan istəsəydin,
Damardan çəkərdim, qan istəsəydin.
Sorğusuz verərdim can istəsəydin,
Qıymadın dövlətə, vara, gəlmədin.

Altay, keçənləri bil röya kimi,
Silinsin, qalmasın bir boya kimi.
Sən də vəfasızsan bu dünya kimi,
Düz çıxmadın etibara, gəlmədin.

## AŞIQ TANINMAZ

Yüz dastan danışıb yüz hava çalsın,
Sözü söz olmasa, aşıq tanınmaz.
Alovun başında pərvanələr tək,
Qəlbi köz olmasa, aşıq tanınmaz.

Canı dost yolunda qıya bilməsə,
Haqqı car eyləyib yaya bilməsə,
Elin kədərini duya bilməsə,
Dərdi yüz olmasa, aşıq tanınmaz.

Dünya yaranalı belədir qərar,
Çox zərin-zibanın axrı tarimar.
Tanrı dərgahında bircə yolu var,
Altay, düz olmasa, aşıq tanınmaz.

*Sazımız – sazbəndimiz*

**Musa NƏBİOĞLU**

# SAZBƏND SÜLEYMAN



Süleyman Mehralı oğlu Süleymanov 1946-cı ildə Kəlbəcər rayonunun Ağcakənd kəndində anadan olub, burada da orta məktəbi bitirb. Hələ uşaqlıqdan tarda və sazda ifası ilə seçilib, məktəbin özfəaliyyət dərnəyinin fəallarından olub. 1966-1968-ci illərdə ordu sıralarında xidmət edən S.Süleymanov hərbi xidmətini başa vurduqdan sonra Ağcakənd Mədəniyyət evinin direktoru kimi fəaliyyətə başlayıb, hazırda da bu vəzifədə çalışır. 1975 və 1987-ci illərdə SSRİ miqyasında keçirilən Ümumittifaq Xalq yaradıcılığı festivallarının laureatı olub. 1976-cı ildə SSRİ Bəstəkarlar İttifaqının keçirdiyi etnoqrafik konsertdə çıxışına görə bu ittifaqın Fəxri fərmanına layiq görülüb. 1988-ci ildə SSRİ Dövlət Kinematoqraflya Komitəsinin Leninqradda (indiki Sankt Peterburq) təşkil etdiyi Beynəlxalq Folklor festivalında birinci dərəcəli diplomla mükafatlandırılıb. Həmin il həm də “Gülüstan” folklor teatrının tərkibində UNESCO-nun Fransada keçirdiyi Beynəlxalq folklor festivalında sazda ifasına görə bürünc medala layiq görülüb.



Sazbəndliyə gəlişi də təsadüfi olmayıb, ata-babası da sazbənd olublar və o, sazbəndliyi atası Mehralı kişidən öyrənib. 1970-ci ildən artıq həm də bir sazbənd kimi tanınmağa başlayıb.

1975-ci ildən isə böyük sənətkar usta Xududan məsləhətlər alaraq bəhrələnib, onun sənət yolu ilə gedib. Özünün dediyinə görə, Aşıq Hidayət, Qəmkeş Allahverdi, Ulduz Sönməz, Ədalət Dəlidağlı, aşıq Sevindik və digər tanınmış aşıqlara saz bağlayıb.

1998-ci ildə Böyük Britaniyanın “OKSFAM” təşkilatı ilə müqaviləyə əsasən bağladığı 23 ədəd saz hazırda bu ölkədədir. Elə həmin müqavilə əsasında bu təşkilatdan aldığı pulla da qaçqınlıq nəticəsində dağılmış emalatxanasını qismən də olsa bərpa edib. Yeri gəlmişkən qeyd edək ki,

Kəlbəcər rayonu da ermənilər tərəfindən işğal olunduqdan sonra Süleyman Mehralı oğlu Yevlax rayonunun Gövər kəndində məskunlaşıb.

Sazbəndliklə yanaşı, həm də aşıqlıq edən Süleyman Mehralı oğlu aşıqlığı də əvvəlcə atasından, sonra aşıq Hidayətdən öyrənib. Daha sonra isə böyük sənətkar Əmrah Gülməmmədovdan bəhrələnib.

Həm sazbənd, həm də aşıq kimi fəaliyyətini davam etdirən Süleyman Süleymanov hər iki sahədə bildiklərini saza və sazbəndliyə meyil göstərən yeniyetmə və gənclərə böyük həvəslə öyrədir. Hazırda sazbəndlik üzrə 14 şəyirdi var. 20 gəncə isə aşıqlıq sənətinin sirlərini öyrədir. Sazbənd şəyirdlərindən Etibar, Müzəffər, Qənimət və Tariyelin adını çəkən Süleyman kişi ondan aşıq sənətinin sirlərini öyrənənlərdən isə Duman, Sevindik, Rasim, Tariyel, Vüqar, İlham, Ələsgər və digərlərinin adlarını qeyd etdi.

Oğlu Söhrab da həm sazbənd, həm də aşıq kimi atasının yolunu davam etdirir.

***Süleyman KƏLBƏCƏRLİ***

### *SAZIM*

*Sızlayırsan qəmli-qəmli,*
*Ərşə qalxıb nalən, sazım.*
*Niyə belə pərişansan,*
*Qərib-qərib çalan sazım.*

*Zümzüməli dağ çayısan,*
*Aranlısan, yaylaqlısan.*
*Dədə Şəmşir soraqlısan,*
*Yurdda tənha qalan sazım.*

*Hanı çəmənin, çiçəyin,*
*Soldu gözəlin, göyçəyin.*
*Ağsaqqalın, ağbirçəyin*
*Yad ellərdə ölən sazım.*

*Pərdələrdə dilə gələr,*
*Alı, Ələsgərli günlər.*
*O sən görən toy-düyünlər*
*Axır oldu yalan, sazım.*

*Elimin daş yaddaşında,*
*Cavansan "Qorqud" yaşında.*
*Süleymanın göz yaşında,*
*Rəngi-ruhu solan sazım.*

### *QALIRAM*

*Haray ellər, qəmli hicran sazında*
*"Dəlidağın" laylasını çalıram.*
*"Şəhid balam, girov balam, vay" deyən,*
*Anaların naləsini çalıram.*

*Namərdə tuş oldum addımbaşında,*
*Gözü yaşla dolur qəlbidaşın da.*
*Xan Tərtərin gözlərinin yaşında,*
*"Dədə Şəmşir havası"nı çalıram.*

*Süleymanın soldu arzu-murazı,*
*Çarx çevrilib, pozulubdu tarazı.*
*Kəlbəcərdə qaldı sənətin sazı,*
*Qərib eldə cürəsini çalıram.*

*Ozan dünyasından soraqlar*

# ÖZÜ BOYDA İŞIQ

***Aşıq Ələsgər Tağıyev 83 yaşında səhnəyə çıxıb öz ifası ilə hamını heyran etdi***



*2012-ci il aprelin 20-də R.Behbudov adına Mahnı Teatrında Tovuz Aşıqlar Ansamblının rəhbəri, ustad aşıq **Ələsgər Tağıyevin (Çopur Ələsgər)** 83 illiyinə həsr olunmuş təntənəli yaradıcılıq gecəsi keçirildi. "Avrasiya Beynəlxalq Araşdırmaları İnstitutu" İctimai Birliyinin dəstəyi ilə gerçəkləşən mərasimdə əvvəlcə ustad aşıqdan bəhs edən sənədli film nümayiş olundu.*

Gecənin aparıcısı, AMEA Folklor İnstitutunun "Aşıq yaradıcılığı" şöbəsinin müdiri, filologiya elmləri namizədi **Elxan Məmmədli** el arasında Çopur Ələsgər kimi şöhrət tapan sənətkarın həyat və yaradıcılığı barədə iştirakçılara ətraflı məlumat verdi.

Aşıq Ələsgər Tağıyev 1930-cu ildə Tovuz rayonunun Bozalqanlı kəndində anadan olub. Ömrünün 54 ilini aşıq sənətinə həsr edib, Azərbaycan aşıqlarının III, IV və V qurultaylarının iştirakçısı olub, üç şeir kitabının müəllifidir. Hazırda Tovuz Aşıqlar Ansamblının rəhbəridir.

Tədbirdə çıxış edən Millət vəkili **Qənirə Paşayeva** ustad sənətkarı uzun illərdir tanıdığını, sənətinə bələd olduğunu bildirdi və ustad aşığın insani dəyərlərindən, özünəməxsus yaradıcılığından danışdı. Qeyd etdi ki, Ələsgər əmini bu yaşa gətirib çıxaran insanlara qarşı böyük sevgisi, qəlbinin təmizliyi, saz-söz sənətinə olan vurğunluğudur. Çətin zamanlarda yüksək ifası, dastan yükü ilə sazı insanlara sevdirən ustad sazın-sözün keşiyində dayanan sənətkardır. Bu günə kimi Aşıq Ələsgər Tağıyevin

ifasında 18 val dinləyicilərin ixtiyarına verilib və Azərbaycan Radio və Televiziyasının “Qızıl fond”unda ustadın qiymətli lent yazıları qorunub saxlanılır. Qənirə xanım ömrünün gözəl anlarını yaşayan aşığa bundan sonra da sazın-sözün keşiyində dayanmağı, məclislərin yaraşığı olmağı arzuladı və ustada hədiyyələr təqdim etdi.

Filologiya elmləri doktoru, professor **Qəzənfər Paşayev** çıxışında aşıq sənətinin özəlliklərindən söz açdı, Ələsgər Tağıyevə cansağlığı və könül xoşluğu arzuladı: “Aşıq musiqiçidir, bəstəkardır, şairdir, aktyordur, sözün yaxşı mənasında məzhəkəçidir, rəqqasdır və ən nəhayət, aşıq dastançıdır. Görün, aşıq nə qədər cəhəti özündə birləşdirən bir sənətkardır. Ona görə də bu sənət həmişə yaşayır və onun daşıyıcıları həmişə xalqın qəlbində özünə yer tutur”.

Folklorşünas alim, filologiya elmlər doktoru, professor **Məhərrəm Qasımlı** ustad aşıq barədə ürək sözlərini bölüşdü: “Aşıq Ələsgər o qədər təbii, səmimi bir insan, bir sənətkardır ki, onun haqqında ürəklə söz demək mümkündür. O, bizim hamımızın eldə, elatda eşitdiyimiz bir sənətkarın adını daşıyır. Bu ad ona da fəxrdir, bizə də fəxrdir. Çünki Göyçəli Aşıq Ələsgərdən sonra Ələsgər adını Allah bu kişiyə qismət elədi. Onun bildiyi dastanların sayı 50-ə yaxındır, qaravəllilərin sayı isə yüzdən artıqdır. Yorulmadan günlərlə qaravəllilər deyər, məclis uğunub gedər. O, böyük bir aktyordur, “Koroğlu” aşığıdır. Onun özündən əvvəl səmimi təbəssümü adamı qarşılayır. Qoy həmişə o bizi təbəssümü ilə, sazı ilə, sözü ilə qarşılasın. Çünki onun ürəyi işıqlıdır”.

Gecədə Aşıq Ələsgər Tağıyevin “Avrasiya Beynəlxalq Araşdırmaları İnstitutu” İB-nin dəstəyi ilə yeni çapdan çıxmış “Elim mənə ilham verib” adlı şeirlər kitabı da sənətsevərlərə təqdim olundu. Kitabda aşığın müxtəlif illərdə yazdığı divani, gəraylı, qoşma, müxəmməs və s. janrlarda aşıq şeirləri, dillər əzbəri olan söyləmələri yer alıb.

Mərasimdə aşıqlardan **Əli Quliyev, Mahmud Məmmədov, Aşıq Abbas, Qələndər Zeynalov, Kamandar Soyutürk** və ustadın nəvələri, **Solmaz Kosayeva, Dəmir Vəliyev, Əlixan Niftalıyev, Familə Göyçəli, Telli Borçalı, Sərdar Məmmədov, Günel Qurbanova, Aşıq Nurəddin, Azər Xanlaroğlu, Aşıq Məhərrəm, Ramil Qaraxanlı, Ramin Qarayev** gözəl saz havaları ilə sənətkarı təbrik etdilər.

Sonda Aşıq Ələsgər Tağıyevin sənətinin işığına yığışanlar ustadın ifasını dinlədilər, sənətə sonsuz sevgisinə heyran oldular. Aşığın böyük oğlu **Eldar Ələsgəroğlu** gecənin təşkilatçılarına, bütün iştirakçılara öz təşəkkürünü bildirdi.

***Təranə Vahid***

# AĞSTAFADA AŞIQ SƏNƏTİ FESTİVALI KEÇİRİLİB



May ayının 8-də Ağstafa rayonunda Mədəniyyət və Turizm Nazirliyinin və Rayon İcra Hakimiyyətinin təşkilatçılığı ilə ulu öndər Heydər Əliyevin 90 illik yubileyinə həsr edilən aşıq sənəti festivalı keçirilib. İştirakçılar əvvəlcə Ümummilli Liderin abidəsi önünə tər çiçək dəstələri qoyaraq xatirəsini ehtiramla yad ediblər. Tədbir Səməd Vurğun adına parkda qədim musiqi alətimizi ədədiləşdirən "Saz" abidəsinin açılışı ilə başlayıb. Rayon İcra Hakimiyyətinin başçısı Məhərrəm Quliyev çıxış edərək Ulu Öndərin həyat və fəaliyyətindən, sənət və sənətkarlara verdiyi qiymətdən danışıb. Qeyd edib ki, bütün sənət növləri kimi, aşıq sənəti də dahi rəhbər tərəfindən həmişə yüksək qiymətləndirilib, bu diqqət-qayğı indi də davam edir. Heydər Əliyev Fondunun, UNESCO VƏ İSESCO-nun xoşməramlı səfiri Mehriban xanım Əliyevanın təşəbbüsü ilə Azərbaycan aşıq sənəti UNESCO tərəfindən bəşəriyyətin qeyri-maddi mədəni irs siyahısına daxil edilib.

Tədbirdə Xalq şairi Zəlimxan Yaqub, xalq artistləri Canəli Əkbərov, Tariyel Qasımov, Əməkdar artist Azad Şükürov və başqaları çıxış edərək Ağstafada gördükləri abadlıq və quruculuq işlərindən, söz-sənət sahiblərinə diqqət və qayğıdan danışıblar. Tədbir iştirakçıları yerli incəsənət ustalarının Heydər Əliyev prospekti boyu təşkil olunmuş çıxışlarına, gül və rəsm sərgilərinə, xalqımızın keçmişini əks etdirən etnoqrafik lövhələrə, idman yarışlarına tamaşa ediblər.

Sonra tədbir Heydər Əliyev Mərkəzində davam etdirilib. Tanınmış aşıqların və yerli incəsənət ustaların çıxışları alqışlarla qarşılanıb.

# NÖVBƏTİ "DASTAN GECƏSİ"

***Gecədə tanınmış aşıqların ifasında dastanlarımızdan parçalar səsləndirilib***





Aşıqlar Birliyinin təşkilatçılığı ilə may ayının 13-də Rəşid Behbudov adına Dövlət Mahnı Teatrında növbəti "Dastan gecəsi" keçirilib. Qurumun belə tədbirləri keçirməsində məqsəd aşıq yaradıcılığında mühüm yer tutan dastanlarımızın təbliği və aşıqların bu sahəyə daha çox diqqət yetirmələrinə nail olmaqdır. Tədbirdə çıxış edən Aşıqlar Birliyinin sədri Zəlımxan Yaqub "Dastan gecəsi"nin əhəmiyyətindən danışıb. Bildirib ki, aşıq yaradıcılığında dastan xüsusı əhəmiyyət daşıyır. Qeyd edilib ki, keçmişdə tanınmış aşıqların iştirak etdıkləri dastan gecələrinin böyük tərbiyyəvi əhəmiyyəti olub



və daim xalq tərəfindən bu ənənənin davamcıları, icraçıları yüksək qiymətləndirilib. Gecədə aşıqlardan Əməkdar mədəniyyət işçisi Ağamurad İsrafilov, Ramin Qarayev, Bəhmən və Firudin Göyçəlilərin ifasında dastanlarımızdan parçalar səsləndirilib.

## ULDUZ SÖNMƏZİN YARADICILIQ GECƏSİ



Mayın 14-də Mədəniyyət və Turizm Nazirliyi və Azərbaycan Aşıqlar Birliyinin birgə təşkilatçılığı ilə Rəşid Behbudov adına Dövlət Mahnı Teatrında ustad aşıq, Əməkdar Mədəniyyət işçisi, ”Aşıq Pəri” məclisinin yaradıcılarından olan Ulduz Sönməzin söz-sənət gecəsi keçirildi.

Tədbiri aparan folklorşünas alim, professor Məhərrəm Qasımlı 50 illik sənət yolunu qeyd edən Ulduz Sönməzin yaradıcılıq gecəsini sənət bayramı adlandırdı. Sənət ocağında dünyaya gələn, beşikdən konlünü saza kökləyən və illər sonra özünü sazdan-sözdən ayrı təsəvvür etməyən aşığın sənət yolundan danışdı.

Gecədə ustad aşıq, Əməkdar mədəniyyət işçisi İsfəndiyar Rüstəmov, Prezident təqaüdçüsü Mahmud Məmmədov, professor Qəzənfər Paşayev və başqaları çıxış edərək Ulduz Sönməzin keçdiyi uğurlu sənət yolundan söz açdılar.

Gecədə sənətkarın yetirmələri və sənət dostları ilə yanaşı, Təbriz aşıqları da çıxış edərək Ulduz Sönməzə yeni-yeni yaradıcılıq uğurları arzuladılar.

Sonda Ulduz xanım sənətinin işığına yığışan hər kəsə təşəkkürünü bildirdi.

# AŞIQ ƏMİRİN YUBİLEYİ KEÇİRİLDİ



Gürcüstanın Bolnisi rayonunun Sarallar kəndində Gürcüstan Aşıqlar Birliyinin və Marneulidəki Azərbaycanlıların Mədəniyyət Mərkəzinin təşəbbüsü və dəstəyi ilə XX əsrdə aşıq sənətinin klassik nümunələrinin yaşadılmasında və inkişaf etdirilməsində böyük xidmətləri olmuş ustad Aşıq Əmir Həsənovun 90 illik yubileyi qeyd olunub. Ustadın qəbirinin ziyarət edilməsilə başlanan tədbirdə şair-publisist Əlixan Yəhyaoğlu ustad Aşıq Əmirin həyat və yaradıcılığından, sənət yolundan danışıb. Gürcüstan Aşıqlar Birliyinin sədri Osman Əhmədoğlu ustadla bağlı xatirələrini dilə gətirib. Telefon bağlantısı ilə tədbirə qatılan Azərbaycan Aşıqlar Birliyinin sədri, Xalq şairi Zəlimxan Yaqub tədbir iştirakçılarını salamlayıb, Aşıq Əmirlə bağlı ürək sözlərini çatdırıb.

Bolnisi rayon İcra başçısının müavini Xələddin İsmayılov, Ukrayna-Gürcüstan Beynəlxalq Universitetinin prorekroru, professor Mahmud Kamaloğlu, "Regionpress" qəzetinin redaktoru Binnət Əlioğlu, "Qarapapaqlar" jurnalının baş redaktoru Akif Xansultanlı, "Meydan" jurnalının əməkdaşı Ehtiram Əmirxanlı, jurnalist Çingiz Yaqubov, şair Zahid Ələmpaşalı, şairlər Şövkət Dağlı və Çoban Rəşid, Sarallar məktəbinin müəllimi Qəşəm Əhmədov, el ağsaqqalı Şəmistan Hüseynov, eləcə də, ustad aşıqlar Astan Kosalı, Məhəmməd Sadaxlı, Meydan İncəli, Aşıq Qərib və digərləri də çıxış edərək ustadla bağlı xatirələrini söyləyiblər. Sonda ustadın oğlanları Aşıq Müslüm və Aşıq Cahangir tədbirin təşkilatçılarına və qonaqlara minnətdarlıqlarını bildiriblər.

Yubiley tədbirində Bolnisi rayon Sakrebulosunun sədri Malxaz Eradze, Sakrebulonun Sosial məsələlər üzrə komissiyasının sədri İsmayıl Məmmədov, rayon İcra başçısının köməkçisi Qayoz Korkava da iştirak ediblər.

# USTA XUDU ANILDI

***İyunun 12-də Rəşid Behbudov adına Dövlət Mahnı Teatrında sazbənd Usta Xudunun xatirə gecəsi keçirilib*.**




Şair Əkbər Qoşalının aparıcılığı ilə keçən gecədə Xalq şairi, Azərbaycan Aşıqlar Birliyinin sədri Zəlimxan Yaqub, professor Qəzənfər Paşayev, Millət vəkili Qənirə Paşayeva, şair, Prezident təqaüdçüsü İlyas Tapdıq və ötən əsrin səksəninci illərində Tovuz rayonuna rəhbərlik etmiş ağsaqqal, ictimai-siyasi xadim Aslan Nəsibov çıxış edərək Usta Xudu ilə bağlı xatirələrini dilə gətiriblər. Aşıqlardan Ədalət Nəsibov, Əli Ürfan (Quliyev), Mahmud Məmmədov, Əhliman Rəhimov, Cahangir Quliyev, Fəzail Miskinli, Gülarə Azaflı, Solmaz Kosyaeva, Ədalət Dəlidağlı, Zülfiyyə İbadova, İsa Dirsəxanlı, Altay Məmmədli, Telli Borçalı, Nemət Qasımlı, Kəmalə Qubadlı, Aytəkin Qənbərqızı, Ramil Qasımlı, Nasir Laçınlı (Alxasov), Elçin Xaliqoğlu və digərlərinin çıxışları tamaşaçılar tərəfindən rəğbətlə qarşılanıb.

Gecədə Usta Xuduya həsr olunmuş “Sazbənd... saza bənd” adlı kitab da təqdim olunmuşdur.





**Mövlud SÜLEYMANLI**
**Xalq yazıçısı**

# YER ÜZÜNƏ MƏKTUB...

*(əvvəli 4(11) 2012-ci il və 1(12) 2013-cü il tarixli saylarımızda)*

## HƏKƏTLƏR – HEKAYƏTLƏR...

Qərb bölgələrimizdə olaylara-olmuşlara **"həkət"** deyirlər. İndinin özündə də tez-tez işlədilən belə ifadələr var: "həkətini gördünmü?" "Başıma gələn həkəti eşitdinmi?" Mənə elə gəlir ki, **"həkət"**sözü hekayət sözünün qərb ləhcəsində işlənən formasıdır. Mən bu kiçik hekayətləri toplayıb işləmişəm. Beləliklə, eşitdiyim kimi:

### I hekayət
### Quş dili bilən Ovçu Əhməd...

Belə deyirlər ki, Ovçu Əhməd bütün canlıların – heyvanların, otun çiçəyin, dilini bilirdi. Gülün-çiçəyin yenicə açılan çağı Ovçu Əhməd yamaca çıxdı, amma ayağını qoymağa yer tapmadı. Ayağını hara qoydu gülün-çiçəyin səsini eşitdi:

– Əzmə məni. Əzmə məni...

O yana baxdı, bu yana baxdı, dırnaq boyda boş yer gördü. Aygülü ayağının ucundaydı, əyilib Aygülündən soruşdu:

– O kimin yeridi, niyə boşdu?!

Amma Aygülü gecələr açıldığı üçün gündüzlər ağır eşidirdi, dinmədi, yaşılca-dəmgilli gözləri vardı altdan yuxarı Ovçu Əhmədə baxdı. Onun yerinə Sərçə gülü dilləndi:

– Ora Qızlargülünün yeridi, gec gəlir, tez də gedir. Bəlkə də elə indi gəldi, ayağını qoyma ora...

Sərçəgülü çox danışan idi, ona görə də adına sərçə gülü deyirdiər. Ovçu Əhməd güldü, yanında daş vardı, daşın üstünə çıxdı... Dədələr də ona görə deyib: "Gülün, çiçəyin Ovçu Əhmədi daşa dırmaşdırdığı vaxtdı..."

**II hekayət**

Bir padşah vardı, onun da bir arvadı. Bir gün arvad padşaha dedi:

– Mənə elə bir imarət tikdir ki, mən evdən baxanda bayırı görüm, bayırdan məni görən olmasın...

Padşah ha fikirləşir, bir şey tapa bilmir.

– Vəzir, vəkil gəlsin!

Gəlirlər, amma onlar da bir çarə tapa bilmirlər. Padşah özündən çıxır:

– Yeddi gün möhlət verirəm, – deyir, – çarəsini tapmasanız ikinizi də darağacınnan asdıracam...!

Vəzirlə Vəkil əl-ayağa düşürlər: "neyləyək, nece eləyək?"

Vəkil çoxbilmiş idi, əyilib Vəzirin qulağına dedi:

– Bu ölkədə ən ağır çəkiyə gələn bilikdi, bilik də ağır olduğundan yuxarıda yaşaya bilmir, aşağıda axtaraq.

Aşağıdan yuxarı ölkənin bütün bilicilərini yığdılar, amma bildim deyən olmadı. Darağacına bir gün qalmışdı, bir gündən sonra Vəzir, Vəkil qarışıq bütün biliciləг darağacından asılacaqdı... Axır-axırda eşidirlər ki, quş dili bilən Ovçu Əhməd sağdı.

Gedirlər, Ovçü Əhmədi tapırlar. Ovçu Əhməd də məsələdən halı olub bütün quşları çağırır yanına:

– Hə, – deyir, – bilirsiz sizi niyə çağırmışam. Deyin, görək neynəmək olar?

Söz verirlər durnaya. Durna qalxır, boğazını uzada-uzada bir təzə mahnı oxuyub qayıdır yerinə. Deyirlər, indi tovuz quşu gəlsin.

Tovuz quşu gəlir; paah, yüz naz-qəmzəylə, "alışdım-yandım", ora baxır-bura baxır, heç nə deyə bilmir, özünü göstərib qayıdır yerinə.

Qarğa söz alır, bir sağa qırr eləyir, bir sola, boğazını arıtlayır ki, təzədən başlasın. Ovçu Əhməd deyir:

– Hə yaxşı, aydındı, keç otur...

Sərçəyə söz verirlər. Sərçə çıxır meydana, gözünü yumub ağzını açır, ürəyini boşaldır, heç kim də heç nə anlamır. Ovçu Əhməd soruşur ki, bəs bayquş hanı?

Deyirlər, bayquş endir eləyib gəlmədi. Ovçu Əhməd deyir, gedin ona çatdırın ki, ömrü boyu gündəlik yeməyini alacaq, gəlsin.

Yüz minnətlə bayquşu gətirib gəlirlər. Ovçu Əhməd soruşur ki, hə, neyniyə billik, nə deyə bilərsən? Bayquş atdanıb yerini dəyişir. Ovçu Əhməd soruşur:

– Niyə belə elədin, sən ki, ağır oturub, batman gəlirsən?

Bayquş deyir:

– Yurd yurddan sayalı gərək...

Ovçu Əhməd deyir:

– Yaxşı neyniyək, Padşah ölkədəki bilicilərin boynunu vurduracaq?!

Bayquş gözlərini yumub xeyli fikrə gedir... Belə deyirlər ki, bayquş çox yatağandı, tez-tez yatıb oyanır, gözlərini açanda da dünyanı dəyişmiş görür, indi də oyanır, xeyli dörd yanına nəzər salır:

– Onda gərək quşlar qırıla, – deyir.

– Ovçu Əhməd soruşur:

– Necə bilirsən, bilicilərmi qalsın, quşlarmı?

Bayquş deyir:

– Bilicilər azdı, bilicilər qalsın...

Quş sümüyündən bir ev tikdirib padşahın arvadını da oturdurlar içində. Arvad evin içindən bayırı görür, bayırdan evin içi görünmür.

Bayquşa da o vaxtdan gündə üç sərçə verirlər. Elə indi də deyirlər, bayquş gündə üç sərçə yeyir. Yeyib çəkilir bir qırağa, başlayır dünyanın fikrini eləməyə...

Belə bir deyim var: "Bayquş hər *yatıb-duranda dünyanı dəyişmiş görər*.

## III hekayət

Ovçu Əhməd gördü səs gəlir, ayaq saxlayıb göy üzünə baxdı. Heç nə yox idi, quş da uçmurdu. Yan-yörəsinə boylandı, səs lap yaxından gəldi.

– Ovçu Əhməd!

– Ovçu Əhməd!...

Ovçu Əhməd elə bildi kəndin qızlarıdı.

– Ay uşaq, kimsən?

Yenə dörd yanına boylandı. Uzaqlarda yaşıl təpəliklər görünürdü...

– Ooy, kirpiklərimi yoldular!...

Balaca qız uşağının səsiydi. Ovçu Əhməd güllərin, çiçəklərin arasında quruyub qalmışdı. Öz qızları yadına düşdü, fikirləşdi ki, yəqin oyun qurublar.

– Oy, əzildim!

– Ooy sürməm sıyrıldı...

Ovçu Əhməd qanrılıb kəndə sarı baxdı; “gülül”, “süddüyən”, “yemşan” komalıqlarının dibləri qaranlıq, görünməz idi. Elə qarasına qızlarını səslədi:

– Ay qız, Yasəmən, Nərgiz, qayıdın evə, döyərəm sizi!

Gülüş səsləri çölü-çəməni bürüdü, Əhməd qonum-qonşunun qızlarını da səslədi:

– Ay qız Çiçək, Bənövşə, Süsən, Lilpar, ay şeytanlar, çıxın görüm hardasız? Ax, Lalə, babana deyəcəm, çıx kolluqdan, utanma.

Allı-yaşıllı çəmənlik boyu yenə gülüş səsləri yayıldı, sonra bayraq küləyi kimi bir əsim yel əsdi, güllər-çiçəklər dalğalanıb yelləndilər...

– Ooy, biz-biz idik, Ovçu Əhməd,
Bir çəmənlik qız idik.
Bizi əzdilər, Ovçu Əhməd,
Çəmənliyə düzdülər...

Səs Ovçu Əhmədin ayaqlarının ucundan gəlirdi. Ovçu Əhməd yavaş-yavaş otluğa, çiçəkliyə çökdü; quş civiltisinə oxşar yüzlərlə səs bir-birinə qarışa-qarışa aləmi bürümüşdü. Əzilib qırmızısı qan kimi ləçəyinə dağılmış çiyələk Ovçu Əhmədlə üz-üzəydi:

– Ayağını qaldır, Ovçu Əhməd, Laləni əzdin...

Ovçu Əhməd gözlərini çiyələyin qanamış yanaqlarına dikdi, çiyələyin xallı, dəmgilli baxışları Ovçu Əhmədə zillənmişdi, səs çiyələkdən gəlirdi.

– Məni də sən əzdin, Ovçu Əhməd, hələ çox yaşayacaqdım, sənin qızın payızağzı dərib meyvəmi yeyəcəkdi.

Ovçu Əhməd ayaqlarının ucuna qalxdı, ayağını qaldırdığı yerdən də Lalənin səsi gəldi:

– Ovçu Əhməd, yaxın dur, cənə söykənim, yıxılacam indi.

Ovçu Əhməd ayaqları altına baxdı, təzəcə buta bağlamaqda olan Lalə başını torpağa qoymuşdu. Ləçəkləri balaca quş qanadları təki cırpınırdı.

– Anam bu yamacdandı, Ovçu Əhməd, atam o yamacdan. Bununla min dönəmdi gəlirəm...

Ovçu Əhməd Laləni dikəltdi...

– Çox sağ ol, Ovçu Əhməd, kökümü də bərkit, – dedi Lalə. – Min birinci kərə də gələcəm.

Ovçu Əhməd Lalənin dibini bərkitdi.

Bayaq nəfəsini içinə çəkmiş kimi görünən çəmənlik təzədən səs-səsə verib oxumağa başladı...

– Oy, ooy, Ovçu Əhməd, bu gün sevgi günüdü...

Bir çırpım külək əsdi, bu sevgi küləyiydi, o yamacdan bu yamaca sevgi qoxusu gəldi, Nərgiz bu yamacdan o yamaca duyduğu sevgi qoxusuna açıldı, dəmgillərinə, xallarınacan sığallanıb nazlandı:

– Ooy, Ovçu Əhməd, nə yaxşı ki, gəldim yer üzünə, – dedi.

Ovçu Əhmədin başı üstündə quşlar sevinə-sevinə qanad döyürdü, sular çöllərin sazını çalıb, sözünü oxuya-oxuya keçib gedirdi. Hər şey bir-birinə bağlı, bir-birindən asılı olduğundan varlıq qurulu bir tamaşa kimi göz qabağındaydı...

Kəndin camaatınınsa bundan xəbəri yox idi; öküzləri, kəlləri qoşub yer əkirdilər. Kotanlar yeridikcə ordan bura nəyinsə yavaş-yavaş səs eləyə-eləyə cırıldığı hiss olunurdu. Ovçu Əhməd bilmirdi bu çağacan hardaymış, otların, çiçəklərin, quşların, heyvanların dilini bilənəcən nə ömrü yaşayırmış. Yer-göy başdan ayağa duyğuymuş, indi bilmirdi ayağını hara qoysun. Gəlib bir daşın üstünə çıxdı. Birdən-birə qavrayıb alışa bilmədiyi duyğuların çoxluğundan özündən gedib daşın üstə uzandı... Aradan nə qədər keçmişdi bilmirdi, gözlərini səsə açdı.

– Bacılı, bacılı, tanıyırsanmı bu adamı?

– Tanıyıraım, Adam atanın oğludu.

– Hə, toruna ceyran düşdü, açdı buraxdı. Çaya daş atmadı ki, balığa dəyər, göyə daş atmadı ki, quşa dəyər. Oxu oxdanında, yayı çiynində, kəməndi qolunda, xəncəri qınında... Ona görə də bütün canlıların dilini bilir indi...

*Amma Vaxt gələcəyə yalançı çiçəklər hazırlayırdı, Vaxt yalançı quşlar yaradacaqdı... Yalanınsa dili yox idi. Ona görə də gələcəkdə heç nəyin dilini anlamaq olmayacaqdı...*

Ovçu Əhməd dikəlib daşın üstündə oturdu, başını qaldırdı ki, iki ağ göyərçin nar koluna qonub danışırlar.

– Baclı,bacılı, o, bizim qardaşımızdı, yatmışdı, oyatdıq. Saya sal, gedək.

Hərəsi qanadından bir ağ lələk saldı, lələklər uça-uça gəlib Ovçu Əhmədin üstünə düşdü... Gələcəyə yaxşı ki, hələ çox vardı...

Güllər-çiçəklər, süsənlər-sümbüllər yenə səs-səsə verib oxyurdular...

*Ooy, oy Ovçu Əhməd,*
*Çiçəklərin qardaşı.*
*Bıçağı qan görmədi,*
*Xəncəri gün görmədi.*

*Tor atdı balıqlara,*
*Toruna özü düşdü.*
*Çıxdı, kəklik ovuna,*
*Əlinə qan izi düşdü.*
*Ooy, Ovçu Əhməd*
*Çiçəklərin qardaşı....*

## IV hekayət

Səhər tezdəndi, sərçələr dil-dil ötür, dünən dediklərini bu gün də çeynəyib tökür, balaca bağçada ağız deyəni qulaq eşitmirdi. Ovçu Əhməd də yuxudan təzəcə oyanmışdı, daha çox şüşə qırıntılarına bənzəyən quş səslərindən bir şey anlamağa çalışırdı. Hələlik heç nə anlaşılmırdı, dayanıb səslərin durulmağını gözləyirdi. Qaraboyun, daha çox torağaya oxşayan ata sərçə, uçub onunla üz-üzə budağa qondu:

– Salamlaşırıq bayaqdan... Üstümüzdən gecə keçib, balaca iş deyil, bu. Sənin də sabahın xeyir, Adam! Hara gedirsən yenə?

– Arvad axşamnan atası evinə getmək istəyir, – dedi, Ovçu Əhməd.

Həyətin o başında göylüyə hörüklənmiş atlar başlarını döndərib oxrandılar; bu, atların soruşmağıydı: “Gedirik yenə?”

Alapaça daylaq həyətin bu başından o başına anasının yanına qaçdı:

– Gedirik! Gediirik!

Ala it komasından çıxıb silkələndi, uzun ala tüklərini çırpıb həyətə göz gəzdirdi... Bir azdan hər şey onun umuduna qalacaqdı. Qorxusuzluqdan, işsizlikdən korşalıb ağırlaşmış səsiylə astadan hürdü, bu, onun:

– Bur-rr-dayam... – deməyi idi.

Arvad, getdikləri üçün qazları qaz damından çıxartmadı, üstəlik qapısının ağzına bir ağac yenə keçirdi. Qapının o üzündən:

– Batdıq, – dedi, erkək Qaz. – Acından qırılacağıq.

– Səni görüm, məni kimi tükün əllərdə qalsın... – Anaş Qaz dimdiyini doldurub yenə nəsə demək istəyirdi arvada. Erkək Qaz:

– İşin yoxdu, – dedi. – Əri bizim dili bilir, eşidər, ayıbdı... Qarğış eləmə, yenə hər nədi, yiyəmizdi. Mən yiyəsiz qalmağı görmüşəm, bunnan da pisdi.

Ovçu Əhməd qaz damının qapısına sarı gəldi, istədi qapını açsın, dönüb arvada baxdı:

– Yazıqdılar, qırma bunları acından, burax çölə.

Arvad hikkə içində əllərini belinə qoydu:

– Sən indi birdən-birə mal qədri bilən oldun? Mən özüm nə yeyirəm ki, onlara da nə verəm...

Ana Qaz hirsindən qapının taxtasını dimdiklədi, o birilər də yaxınlaşdılar, analı-balalı qapını çeynəməyə başladılar. Deyinə-deyinə, söylənə-söylənə dimdiklərini taxtaya döydülər. Tıqqıltı həyəti başına götürmüşdü...

Arvad yır-yığış eləyirdi, daha doğrusu, atası evinə aparmaq üçün bir şey tapmadığına görə əlinə keçəni ora-bura tullayırdı. Boynu ponpullu anaş toyuq da arvadın yan-yörəsində küllənirdi, dimdiyinin ucunda qığıldadı:

– Yumurtam var, məni belə qoyub hara gedirsən? – dedi.

Arvad əlindəkini əl-ayağına dolaşan toyuğa tərəf atıb:

– Kiş, kiş, xeyirsiz, mən kimnən yarımışam ki... – Ərinə söz atırdı.

Bunu toyuq da başa düşdü, gözlərini süzdürə-süzdürə Ovçu Əhmədə baxdı:

– Ər deyil ki, elə bil dən torbasıdı, – dedi, aralandı. –Arvadağız...

Toyuğun sözü doğrudan da Ovçu Əhmədə toxundu, dümələnə-dümələnə Xoruza sarı gedən toyuğun ardınca baxdı. Xoruz boğazını arıdıb qanad çırpa-çırpa xoruzlandı:

– Gündüz dalaşdıqlarına baxma, – dedi, – gecə bir-birinin qucağınnan çıxmır.

Toyuq gözlərini o yandan belə dolandırıb yenə süzdürdü, bir anlığa bozumtul pərdə gözlərini örtdü, sonra da qanadlarını qaldırıb özünü yellədi...

Arvad elə bil toyuğu indi gördü, toyuq burcuda-burcuda özünə yer eşirdi.

– Bu yoluq bostanı eşəcək, – dedi, arvad, toyuğu ərinə göstərdi. – Sən atları yəhərlə, mən bunun ayağının patavasını- papucunu geyindirim.

Toyuq qorxusunda az qaldı uçub getsin, özünü ora-bura vurdu. Arvad qayım parçadan tikdiyi şapşapları gətirib bərkdən:

– Yass, yass, – dedi.

Toyuq qanadlarını gərib hardaydısa orda çöküb arvadı gözlədi. Arvad papucları toyuğun ayaqlarına geydirib, ora-burasını əlləşdirdi.

– Ymurtası var ki, bunun... – Elə ehtiyatla yerə qoydu ki, elə bil doğrudan da əlindəki yumurtaydı.

Ovçu Əhməd də dedi:

– Yazıq bayaqdan ayaqlarına dolaşa-dolaşa onu deyirdi...

Toyuq hinə sarı getdi ki, yumurtlasın, amma onu da bilirdi ki, hələ tezdi. Boğazını uzadıb hinə baxdı; yumurtaya bənzər bir şey vardı hində.

Gözlərinin qabağında ağlı-qaralı xeyli cücə canlandı. Yumurta üstündə həmişə gözlərinə belə şeylər görünərdi. Elə bu cür də, yəni, gözləriniun önündə ağlı-qaralı cücələr hinə yatdı.

Evdə adam olmadığından ala itin itliyi tutmuşdu. Qulaqlarını şəkləyib hər səsə hürürdü. Qazlar arakəsmədə qığıldaşır, ana baladan, bala atadan soruşurdu:

– Nolub?

İtin səsində qorxu yox idi, eləcə, burdyam, deyirdi...

Yumurta anaş toyuğun içiylə Ay göy üzüylə süzdüyü kimi süzə-süzə yol gəlirdi. Bunun azacıq acısı olsa da toyuğa ləzzət eləyirdi.

Kənddə səssizlik idi. Bir quşlardı, itin səsinə, qazların qığıltısına bağlı yumurtadan çıxandan nə deyirdilərsə, indi də onu deyirdilər. İt seyrək-seyrək hürürdü. Elə bu səsə görə də Ovçu Əhmədin həyəti ***“ala itdən manşır”*** idi. Obanın o başından ala itin səsini tanıyırdılar.

Amma qazların da Ala itin də, Anaş toyuğun da, hələ evin künc-bucağında yuva qurmuş həyət quşlarının da gözü yoldaydı ki, Ovçu Əhmədin arvadı Sarı Sarıca nə vaxt gələcək, əlindən-ovcundan düşəni dənləyib yeyəcəklər.

Yaddaşlarının qurtaracağında bir balaları, bir yuvaları, bir də Sarı Sarıcadan özgə heç nə yox idi.

Anaş toyuq yumurtlayan kimi yüp-yüngül oldu. Atdanıb tara çıxdı:

– Bir yumurta-aaa yumurtlamışam!...

Həyətdə heç kəs yox idi. Toyuğun səsini qonum-qonşu eşidirdi. Ovçu Əhmədlə arvadı onda atların belində yol gedirdilər...

## V hekayət

Ovçu Əhməd arvadı Sarı Sarıcayla qonşu kəndə gedirdilər. Hərəsi bir ata minmişdilər. Arvadın atı daylaqlıydı. Yanaşı addımlayırdılar. Yamacda adamlar göründü, ocaq qalamışdılar...

– Yandıı-ım!...

Güllərin-çiçəklərin səsi gəlirdi. Ocağın istisindən, tüstüsündən kollar-komalıqlar içini vururdu. Nar ağacı öskürüb üstündən narlarını saldı, çəkilib dərisinə-qabığına sığındı, yəqin ki, bu, onun ağlamağı idi. Yaxınlıqda ox atıldı, oxdan lap tüfəng səsi gəldi. Yal-yamac bərkdən içini çəkməyə başladı...

Ovçu Əhmədin üz-gözü qırış-qırış olmuşdu.

– Niyə ağlayırsan, ağlarqalmış, nolub? Qan-yaş tökərmi kişi də? Ayrı arvad istəyirsən, açığını de?! – Sarı Sarıcaydı.

Ovçu Əhməd başını qaldırıb:

– Kimdi ağlayan? – dedi.

– Bə nəyin fikrini eləyirsən? Mən fikir eləməliyəm ki, sənin kimi ərim var. Nə əynim geydi, nə qarnım doydu...

Ətrafdakı ağaclardan, otlardan, çiçəklərdən gülüş səsləri gəldi. Ovçu Əhmədin kefi duruldu, yan-yörəsinə baxıb gülümsədi. Onun belə gülümsəməyi arvadı lap özündən çıxartdı, atın üstündən əllərini ərinə sarı uzatdı:

– Kül dəli başına, bu da mənə ər olub, dilbilməz!

Elə bu vaxt daylaq kişnədi:

– Ana-aa, yorulmuşam.

At Sarı Sarıcanın altında boynunu döndərib oxrandı *("oxranmaq" sözünü yadınızda saxlayın, sevin, həmişə lazım olacaq, hər heyvanın özünün istəyini bildirmək ifadəsi var; it cənsiyər, yalmanar, şırvanar, bu hürmək deyil, nəsə istəməkdir, eləcə də qoyun imrənər, at da oxranar):*

– Özün gəl, – dedi, – neynim yorulmusan. Gör nə qədər yüküm var, biri belimdə, biri belimdəkinin qarnında, biri də öz qarnımda, səni harama götürüm?!

Ovçu Əhməd daha özünü saxlaya bilmədi, bərkdən güldü.

Sarı Sarıca acığından özünü didişdirdi, sonra atdan düşüb *yalı yolu,* yəni tərsinə getdi.

– Sənnən bir addım da atmaram daha, – dedi. – Sənin fikrin məni dəli eləməkdi.

– Qayıt, yaxşı, bir də gülmərəm.

Kəhər at Ovçu Əhmədn altında oxranıb ana ata, yəni madyana baxdı:

– Bunların gününə bax.

– Özləri bilər, – dedi madyan. – İnsan nə elədiyini nə vaxt bilib ki. Otunu otla, biz onların işinnən baş açammarıq...

Ovçu Əhməd atdan enib arvadının ardınca getdi.

– Qayıt, yaxşı, sənə gülmürdüm.

Azca aralıda sürü otlayırdı. Bir qoyunla bir qoç sürüdən çıxıb Sarıcaya tərəf gəldilər. Qoç imrənib:

– Bu dəfə quzun mənə oxşayacaq, – dedi.

Qoyun sürüdəki qoçlara baxdı:

– Onu hələ bilmək olmaz, – dedi, atdanıb dərənin o biri tayına keçdi. – Gəl dalımca...

Qoç burma buynuzlarını silkələyə-silkələyə dedi:

– Mən sənə Ovçu Əhməd deyiləm ki, arvad dalınca düşəm...

Ovçu Əhməd arvadına çatmışdı, qoçun dediyini eşitdi, təzədən gülüb geri qayıtdı. Atını minib yolunu getməyə başladı. Sarı Sarıca qışqıra-qışqıra onun ardınca qaçırdı. Qoyun da qayıdıb dərəni keçdi, burmabuynuz qoçun ardınca düşdü...

## VI hekayət

Ovçu Əhməd həyətdəki kirkirə daşının üstündə oturmuşdu, arvadının deyintisindən üzünün tükləri biz-biz olmuşdu. İstəyirdi, arvadının cavabını versin, desin ki, mən neynim sən var-dövlət istəyirsən. İstəyirsən xan arvadının evi kimi evin olsun, sən də olasan xan arvadı. Mən bunu bacarmıram, neynim... Bayaqdan istəyiridi belə desin, amma bir anaç qazı vardı, qazların arasından ayrılıb gəlib Ovçu Əhmədlə üz-üzə durmuşdu, kirpiksiz göy gözlərini süzdürə-süzdürə deyirdi:

– Ovçu Əhməd, aadı (qətiyyən) arvadını qınama, arvadın düz deyir. Mən də bayaqdan öz kişimə deyirəm. Deyirəm, boynunu yoğnudub yanımda nə qazdanırsan, on baş külfətik, – Anaş qaz burda qanadının birini gərib lələklərini göstərdi. – Düz on baş, saxla bizi, yedirt, ot tap, dən tap. İnsanlar elə doğru deyirlər ki, mal yiyəsinə oxşayar... Sənə oxşayıb daa.

Ovçu Əhməd qazın belə deməsinə bərkdən güldü. Ərinin öz-özünə gülməsi yenə arvadı özündən çıxartdı:

– Nəyə gülürsən, – dedi, – maygülü kimi?!

Ovçu Əhməd çöllüyə-çəmənlyə doğru boylandı ki, görsün maygülü arvadının dediyini eşitmədi ki. Amma tez də yadına düşdü ki, payıza yaxındı, maygülü qayıdıb gedib. Qaymaqçiçəyininsə lap söz anlayan, yetişmiş, anlaqlı vaxtıydı, ləçəyini şeşəldib qulaq asırdı:

– Qoy maygülü gəlsin, xəbər verəcəm hamısını, – dedi qaymaq çiçəyi. – Gör bir, dalca danışır.

Ovçu özünü saxlaya bilmədi, yenə güldü. Arvad əllərinin içini göstərdi:

– Belə arsız olduğun üçün evin-eşiyin qaz örüşü kimi qupquru qalıb...

Arvad belə deyəndə anac qaz boğazını irəli uzadıb erkək tayına tərəf getdi:

– Görürsən, səni deyir, utan, adın alaitdən manşırdı.

Alait komasına girib yatmışdı, bunu eşidib çıxdı, yuxulu-yuxulu bir-iki ağız hürdü:

– Məndə işin olmasın...

Ovçu uğunub getmişdi, artıq heç nə eşitmirdi. Elə bu vaxt gördü, erkək qaz anac qazı da yanına salıb deyinə-deyinə gəlir. Gəlib çəp-çəp Ovçu Əhmədə baxdı:

– Arvadına deynən, aramıza qalmaqal salmasın. Hardan alım mən buna, təzə yeri, örüşü. Hər yan quru qalıb, bir qarış yerin yüz yiyəsi çıxıb...

– Arvadına lazım olanda tükümüzü belə yolur baa-ax. – Anac qaz qanadlarını açıb yığdı, gözlərini süzdürə-süzdürə dedi.

– Əvəzində də heç nə vermir. Arvadın deyilmi? Başa sal, bizə pis baxır, ac saxlayır. Mən boyda qaz, yarı yaşımı keçmişəm, acınnan toyuğa oxşayıram. Arvadın bilsin ki, bunnarın hamısı borcdu üstünüzdə... Mən neynirdim bu qədər balanı, yetim onlardan yaxşı yaşayır. – Erkək qaz boynunu döndərib burdan ora palçıqlı, bulaşıq suda qum yeyən balalarını göstərdi. – Odu bax, acından başlarını sudan çıxartmırlar, qum yeyirlər. Arvadın elədi hamısını, yumurtaları yığıb qoydu bu ayağısürüşkənin altına...

Anac qaz:

– Neynim, heç özüm istəyirdim ki, – dedi, – üstümə xəlbir keçirdib güclə yatırtdı. Bala saxlamaq vaxtıdımı indi, aclıqdı, odu eey, hamısı qum yeyir. – O da dönüb balalarına baxdı. – Çoxu da heç mənim yumurtamnan deyil.

Qazların səsi həyəti başına götürmüşdü. Arvad birdən süpürgəni götürüb qazların ikisini də döyəclədi:

– Bunnar da vaxt tapdı, gör nə hay-küy salıblar.

Erkək qaz yenə nəsə demək istəyirdi, süpürgə düz başından dəydi:

– Tüpürüm belə yaşamağa, – balalarına sarı getdi, boynunu döndərib yenə Ovçu Əhmədə baxdı. – Aparın hamımızı satın, sizdən qaz saxlayan olmaz. Ya da kəsin, yeyin. Belə yaşamaqdan ölmək yaxşıdı.

Ovçu Əhməd tut ağacının dibində oturub mat-məətəl gah arvadına baxırdı, gah qazlara.

– Bu ağacı da qurudacam, – dedi, arvad. – Sabunnu su töküb dibinə, qurudacam. Elə eləyəcəm ki, oturmağa bir kölgəlik tapmayasan.

Ovçu Əhmədin doğrudan da ağac indi yadına düşdü. İri, qollu-budaqlı tut ağacı idi. Budaqlarında xeyli quş vardı, susub dinləyirdilər. Arvad belə deyəndə ağac tərpəndi, susuzluqdan bərkimiş dibi bir neçə yerdən çatdadı, nəfəs dərib nəsə demək istəyirdi ki, Ovçu Əhməd səhəngi götürüb suyunu ağacın dibinə boşaltdı, ağac dərindən:

– Oxqay... – dedi.

## VII hekayət

Hər yan ağappaq işıq içindəydi, amma birdən birə hava qaraldı...

Çobanəppəyi bayaq günə dikəlib havanı içirdi. Çən-çiskin gəlib havanı qaraldan kimi bürüşüb ləçəklərini üstünə çəkdi...

Azca aralı dağbənövşəsi qayanın güneyində fikirli-fikirli dayanmışdı, üstündən çiskin addadıqca nəmlənirdi.

Ovçu da atını həmin qayanın tuşunda saxladı. Dörd yanına boylanıb atın yalmanını sığalladı:

– Çoban Aykəmin arxacını kimnən soruşaq? Belə tapa bilməyəcəyik...

At yedəyində dartınıb oxrandı:

– Mən də bilmirəm, bircə yol getmiş olsaydım tapardım.

Qayanın dibindən səs gəldi:

– Sağa get, Ovçu Əhməd, bax, o bələni aş...

Ovçu qayaya sarı əyilib gülümsədi. Bayaqkı çobanəppəyi qayaya söykənib saçaqlarını sallamışdı:

– Ovçu... – Çobanəppəyi yenə nəsə demək istəyirdi.

– Sən ayaq altda bitdiyinə görə kobudsan, – dağbənövşəsi bir az aralıda özü-öz şehini çırpıb qoxulanırdı, bu sözləri çobanəppəyinə dedi.

– Ağıllı danış, mən Ovçudan min yaş böyüyəm, – dedi, çobanəppəyi.

Bir kökdən çıxıb beş özəyə ayrılmışdı, beşi də dönüb bənövşəyə baxdı. Bu sözü də hansı özək dedi, nə dağbənövşəsi bildi, nə də Ovçu Əhməd.

– Bu il gələnsən, hamı bilir bunu.

– Sən gəldin ki, mən varam, sən gedəcəksən, mən yenə qalacam. Sağa get, Ovçu Əhməd, çoban Aykəmin arxacı sağdadı...

Sağ bələni aşanda Aykəmin arxacı göründü... Ovçu Əhməd dayanıb tamaşa eləyirdi; həyat öz nizamıyla davam etməkdəydi. Bir az aralıdan çay axırdı, çayın qırağında bir madyan otlayırdı, Ovçunun kəhər atını görüb kəsik-kəsik kişnədi:

– Gəl məni dişlə... Gəə-əl!

*Dələmə tutmaq* vaxtı olduğundan bir-birinin ardınca arxaca çoxlu sərçə uçuşdu. Balası olan da, olmayan da balasını səsləyirdi.

– Yem tapmışam, dən tapmışam, gəə-əl!...

Sonra arxacdakı göy it bir-iki ağız hürdü.

– Ovçu dostumuz gəldi.

Çoban Aykəm də itin səsindən bildi ki, dosta hürür...

## VIII hekayət

Göy it başını qollarının üstə qoyub sözlü-sözlü Ovçu Əhmədə baxırdı. Gün batmışdı. Günün batdığına görə səs-küy də yer üzündən işıq kimi çəkilib getməkdə, azalmaqdaydı. Yüngül, çevik yaylaq quşları deyinə-deyinə diblərə çəkilirdilər...

Hava qaraldıqca yan-yörədən ətrafa gizli-gizli narahatçılıq yayılmaqdaydı.

Yaylağa zil qaranlıq çökdü. Hava buludlu olduğundan ay-ulduz görünmürdü.

Kəlin toğlu (yəni buynuzlu, qonur üzlü) başını qoçun buynuzlarına sürtdü:

– Dərədən canavar iyi gəlir...!

Arxac ocağının qırağındaydılar. Ovçu patavasını qurudurdu. Qoç sürüdən aralanıb mələdi, o da:

– Havadan canavar iyi gəlir, – dedi.

Çoban Aykəm qonağın narahatçılığını görüb:

– Sürü canavar duyub, ona görə mələşir, – dedi, üzünü uzaqdan mağara ağzı kimi görünən dərəyə tutub qışqırdı: – Hey, ağzıyanmış!

Sürünün üstünə elə bil su səpdilər. Dincəlib təzədən yatışdı. Səssizlik çökən kimi burmabynuz qoçun tükləri biz-biz oldu. Ovçu Əhməd nəzərlərini qaranlığa dikib gülümsəyirdi. Ona elə gəlirdi ki, çoban Aykəm də bütün canlıların dilini bilir. Elə bu vaxt yuxarı qayalıqlarda canavar uladı.

– Auu-u! Tufan qopacaq, ildırım çaxacaq, auu-uuu! Baxtım oyanacaq, sürü bölünəcək, mənim olacaq, au-uuu!

Arxacın ətəyindən də göy it hürdü, canavara cavab verirdi:

– Yiyəm qara dəmgilli, axsaq qoyunu kəssin, versin mənə, mən yeyim, sən gəl, görüm mənə neyniyə bilərsən?!

Canavar yerini dəyişmişdi, başqa yöndən uladı:

– Ələ baxan, nökər, sənin özünü də parçalayacam. Mənnən olub, məni tanımayan satqın!

Çoban Aykəm üzünü qaranlığa tutub yenə qışqırdı:

– Hey, ağzıyanmış!

Ovçu Əhməd gördu çoban Aykəm bundan o yana bir şey anlamayıb:

– Hürən hansı itdi? – soruşdu.

– Göy itdi, başqa itim yoxdu.

– Bəs, sürüdəki dəmgilli, axsaq qoyun hansıdı?

– Onu neynirsən qonaq?

– Kəs onu!

– Sən mənim sayılan-sanlı qonağımsan, bu nə sözdü danışırsan. Sənə burmabuynuzlu...

– Yox, axsaq qoyunu kəs, ver göy itə.

Çoban axsaq qoyunu kəsib göy itə verdi.

– Bunu başa düşmədim, – dedi.

– Sabah başa düşərsən...

Elə bil Ovçu Əhmədin bu sözünə bənd idi; ildırım çaxdı, şimşək oynadı, sürü ayrılıb iki yerə bölündü. İyirminci əsrin şairləri demiş, dərələr gələcəyin şəhərləri kimi uğuldayırdı.

– Sürü bölünəcək, ruzum gələcək, au-uuu!...

Canavar zil qaranlıqda sürünü körpə quzusunacan görüb ağzını yalayırdı...

– Sürümüz bölündü, qonaq qardaş, sən bu bölüyün yanında ol, mən o birisinin ardınca gedim.

Ovçu sakitcə soruşdu:

– Gör it arxacdadımı?

İt yox idi, sürüylə getmişdi. Çoban sürünün bölüyünü çox axtardı, tapa bilmədi, qayıtdı. Ovçu Əhməd yenə ocağın qırağında əyləşmişdi.

– Gəl otur, gəl, isin, – dedi. – Sürüyə heç nə olan deyil. Olsa itiyini mənnən alarsan.

Çoban ocağın qırağında əyləşib təəccüblə Ovçu Əhmədə baxırdı:

– Yoxsa qurd ağzı bağlamısan, qonaq?!

– Yox, qurd ağzı bağlamağı bilmirəm, amma bir quzunun da burnu qanamayacaq, arxayın ol.

Sürü dərənin lap dərinliyində bir qayanın altında özünə yer elədi. Göy it sürünün başına dolanırdı. Canavar qayanın üstündən baxıb uladı.

– Kökünü danan köpək, mənnən olub, mənə oxşamayan, səni parça-parça edəcəm!

– Sus, yiyəsiz yalquzaq, sən yiyəmin bir axsaq toğlusucan da deyilsən.

Canavar yuxarıdan aşağı bir qaya beli də atdandı:

– Mənim tayımı sənin yiyən öldürdü, yalqız qaldım, yalquzaq oldum, gəl mənim tayım ol, birgə yaşayaq.

İt hürdü, itin bu dəfəki hürməyi yiyəsini köməyə çağırmaq üçün idi...

– Yiyəm gələcək indi!

– Birini yeyəcəm, qırxını parçalayacam, a-uu-uu!

Canavar qayadan yerə atdandı, göy it elə göydəcə onun qarnından yapışdı. Dərə aşağı yumarlandılar. Göy it səhərəcən ağzını açıb canavarı

buraxmadı. Səhər tezdən iti elə bu şəkildə də tapdılar. Canavar ölmüşdü, göy it də yiyəsini görəndən sonra öldü, elə həmin yamacda da basdırdılar...

– Bu yaxşılığın əvəzində sürüdən seç, qırx qoyun apar, – dedi çoban.

Elə bu vaxt qaragözlü şişək toğlu mələdi:

– Ovçu Əhməd məni götür, tək mən yüz qoyun anası olacam.

Bu yandan da burma buynuzlu qoç mələdi:

– Məni də götür, mən də yüz qoyun atası olacam.

– Elə bu ikisinə bərəkət, bu ikisi bəsimdi, – dedi Ovçu Əhməd, toğluları alıb yola düşdü.

## IX hekayət

Dünyanı su basmışdı, hara baxırdın su... Ailəsiylə gəmidəydi, bütün heyvanlardan da özüylə götürmüşdü, dünyanı su basandan üzürdülər, quruya rast gəlmirdilər. Azuqə tükənmişdi, üç-dörd günlük su qalmışdı. Ona görə də fikirləşirdi ki, neyləsin...

Qarğa dor ağacına qonmuşdu, kömək eləmək istəyirdi, amma ağlına yeməkdən başqa bir şey gəlmirdi. “Yeməsəm fikirləşə bilmərəm”.

Göyərçin başlarının üstündə dövrə vurub yenə qayıdırdı gəmiyə. Yiyəsini belə görüb dinclik tapmırdı.

İt için-için zingildəyirdi.

Pişik gəmini qoyub qaçmaq istəyirdi, amma hara qaçasan, hər yan sudu, beləcə, pusquda dayanıb fürsət gözləyirdi.

– İlan da neçə gündü fikirləşirdi, qıvrılmışdı, başını qıvrımından çıxartmırdı...

Sərçə Onun dizinin üstə qonub tələsə-tələsə nəsə deyirdi, heç nə anlaşılmırdı.

Gəmidə nə qədər canlı vardı, narahatçılıq içindəydi...

– İlan qəflətən başını qıvrımından çıxardıb:

– Torpağı gördüm, – dedi, dor ağacına dırmaşdı ki, uzaqlara baxsın. – Torpaq gözümə göründü, axtarmalıyıq.

Leylək dedi:

– Axtarmağa mən gedim...

O:

– Yox, – dedi, – sən yaz quşusan, dözə bilməzsən.

Bayquş dedi:

– Mən gedim.

– Yox, sənin qanadın ağırdı, gedib gəlməyin uzun çəkər.

Sərçə dedi:

– Mən gedim.

Sərçəyə fikir verən olmadı. O, sərçəni ovcuna alıb sığalladı:

– Qarğa getsin, – dedi. – Qarğanın üzü bərkdi. Getsin qurudan xəbər gətirsin.

Qarğa uçmağa hazır idi, amma bilmirdi, hansı yönə uçsun.

– Hansı səmtə uçum?

– Bütün səmtlərə uç. Qanadın kəsənəcən get. Bəlkə qohumlarına da rast gəldin.

İlan quyruğu üstə qalxmışdı.

– Uğur olsun, get, tapacaqsan!

Qarğa gündoğana doğru uçdu.

Aradan nə qədər keçmişdi bilən yox idi. Hər yan su, göz işlədikcə su...

Qarğa yorulub əldən düşsə də, gecə-gündüz qanad çırpırdı. “Bəlkə qohumlarını da tapdın”. Onun bir bu sözü yadındaydı, ona görə də var gücüylə uçmaqdaydı...

Dan yeri sökülürdü... Birdən-birə dənizin havası dəyişdi. Yorğunluqdan qarğanın halı özündə olmasa da, dəniz havasının dəyişməsini hiss etdi, ayılan kimi oldu. Uzaqdan bir dağın zirvəsini gördü. Qışqırmaq istədi, səsi çıxmadı. Qanadlarına güc gəldi, bir dağla üz-üzə gəldi, uçub dağın zirvəsinə qondu. Bir yarısı çəmənlikdi, bir yarısı qayalıqlar...

Dincini alıb qayıtmalıydı. Qayadan qayaya qona-qona yamaca gəldi. Gəldi, bir öküz leşinin üstünə çıxdı. Başladı yeməyə...

Aradan nə qədər keçmişdi yenə heç kəs bilmirdi. Qarğa leşdən o qədər yemişdi, artıq yadında heç nə qalmamışdı. Yenə yeməkdəydi, ona görə də qayıtmadı.

Gəmidə narahatçılıq böyümüşdü. Bayquş Ona dedi:

– Qarğanı göndərməkdə səhv etdin. Gərək üzübərk olanı göndərməyəydik.

– Bəlkə başına bir iş gəlib... – Dovşan dedi, titrəyə-titrəyə.

– İlan neçə gündü yenə qıvrımından başını çıxartmırdı. Günlərin birində ayılıb başını çıxartdı:

– Yenə torpağı gördüm, qarğanı da üstündə.

Göyərçini göndərdilər...

Göyərçin qarğa uçan səmtə uçub gözdən itdi. Yorulmadan qanad çaldı, günlərin birində torpağı gördü. Qarğa yenə leş yeyirdi. Özü də o qədər kökəlmişdi ki, qanadları özünə dar gəlirdi.

Heç nə demədən qanadı üstə geri döndü... Beləcə, Onun gəmisini quruya gətirib çıxartd...

Ona görə də göyərçin bütün zamanların sınaqlı, sayalı quşudu...

## X hekayət

*(nağıl-film)*

Şeytan balasıyla gizlənpaç oynayırdı. Dünyanın nə vaxtıydısa, yuxarıda Tanrıdan, aşağıda Adam Atadan başqa heç kəs yox idi.

Tanrıyla Adam Atanın arasında ana-bala oyun çıxardırdılar. Anası gözlərini yumurdu, balası gizlənirdi, balası yumurdu anası gizlənirdi. Amma gizlənməyə yer tapa bilmirdilər. Şeytanın əlindən harda, necə gizlənmək olar?

Şeytanın anası gözlərini bir də yumdu. Balası ora baxdı, bura baxdı, gördü dağın ətəyiylə çay axır, suyu köpüklənib, üstü qabarcıqlarla doludu; "hopp" eləyib suyun köpüyünə qarışdı, qabarcıqların birinə girib gizləndi.

Anası gözlərini açan kımi balasını gördü:

– Görünürsən, – dedi, – hər yerin görünür.

Şeytanın balası sürüşüb su köpüyünün lap qatı yerinə girdi. Çay şeytanın qorxusundan dartınıb, gərilib başını daşlara vurdu. Suyun köpükləri bir yerə yığışmışdı, elə bil güclü külək əsirdi. Əslində külək yox idi.

Şeytanın havası hər yeri bürümüşdü. Anası dedi:

– Görükürsən... dalın görükür.

Çayın suyu qorxudan damar-damar olmuşdu, hava qabarcıqları bir-birinin ardınca səs eləyə-eləyə çatdayıb açılırdı.

Şeytanın balası üzə çıxıb anasına baxdı:

– Kimsə xəbər verir. Yerimi sənə göstərən var.

Şeytanın anası güldü:

– Yerlə Göyün arası bir bizik. Tanrıdan başqa bizi görən olmaz.

Tanrının adını eşidən kimi şeytanın balası dik atıldı, başı buludlara dəydi. Ağ-ağ, topa-topa buludlardı, çaxnaşma düşdü, qapqara qaralıb iki ayrıldı, ildırım çaxdı...

– Bulud da suymuş, – dedi, şeytanın balası.

Şeytanın anası onu izləyirdi:

– Hə, sudu, – dedi, – su bizi götürmür...

Elə yağış başladı ki, yerlə göy bir oldu.

– Bu da Tanrının işidi, – dedi, şeytanın balası. – Mənim yerimi də sənə O göstərir. Ona de, bizim oyunumuza qarışmasın.

Tanrı doğrudan da hər şeyi görürdü...

Aralıda çiçəkli bir yamac vardı, şeytanın anası yağışı, seli o yamaca göndərmişdi. Amma mələklər qanadlarını gərmişdi yamacın üstünə, çiçəkləri qoruyurdu. Hər şey nizam-düzən altındaydı, hər şeyin üzərində Yaradanın nəzəri vardı.

Tanrı yuxarıdan aşağı baxıb gülümsədi. Yer üzü köynək-köynək işıqlandı. Yağış damcıları Tanrının gülümsəməyindən nura qərq oldu. Çayın da elə bil suyuna sığal çəkdilər. Çöl-çəmən yenidən öz əbədi mahnısını oxumağa başladı.

Şeytan balasına:

– Bir də gizlən, – dedi. – Elə yer tap, heç Tanrının da xəbəri olmasın.

Şeytanın balası hər yeri ələk-vələk elədi, Aladağdan Qaradağa qarış-qarış gəzdi, gizlənməyə yer tapmadı. Hər yer Tanrının ovcunun içindəydi...

Şeytanın balası bir dağın yamacında oturub özü öz quyruğuyla oynayırdı. Elə bu vaxt qarşı yamacda Adam Ata göründü. Əlində əsası, çiynində xurcunu, çayın addamacından keçirdi. Şeytanın balası ora baxdı, bura baxdı, "hopp" eləyib Adam Atanın ürəyinə girdi...

"Tıp-tıp, tıp-tıp..."

Şeytanın anası balasını arayırdı, gördü tapa bilmir adıyla çağırmağa başladı:

– Vasvası, Vasvası...

Vasvası heç yanda yox idi. Anası onu axtarmaqdan yorulub əldən düşmüşdü. Yamacda Adam Atanı gördü, nə fikirləşdisə yenə balasını çağırdı.

– Vasvası, Vasvası...

Vasvasının səsi Adam Atanın içindən gəldi:

– Burdyam, tıp-tıp, burdyam...!

Şeytanın anası çox sevindi, çünki balasının yeri istiydi, Tanrının da baş açmadığı bir yer tapıb gizlənə bilmişdi...

## XI hekayət
Yağış uşaqlar

*(1970-ci illərin ortalarında "Azərbaycanfilm" kinostudiyasında işimlə bağlı silsilə nağıl-filmlər yazdım. Mövzuları yenə də xalq düşüncəsindən götürmüşdüm. Bilirəm, indinin özündə də ölkəmizdə olan, olmayan kinostudiyalar, – kinostudiyaların nəinki rəhbərliyi hətta yaradıcı adamları belə bu yazdıqlarımı görəcək səviyyədə deyillər. Amma əminəm ki, vaxt gələr, görərlər. Ona görə də işləyib* ***Vaxt-Zaman üçün*** **hazırlamaq** *lazım idi.)*

Göy üzünə topa bulud gəldi. Aşağılarda dərələr ağızlarını açıb nəfəs dərirdi. Bir yandan da külək əsməkdəydi. Buna gərə də bulud özünə yer tapa bilmirdi; dartına-dartına, əyilə-əyilə özünü güclə saxlayırdı. Yerə baxdı...

Elə bil topa buludu sıxdılar, suyu damcıladı... Torpaq aşağılarda arxası üstə səvərmişdi, damcıları görüb gərnəşdi, kökləri şaqqıldadı. Dovşanlar, tülkülər, quşlar, böcəklər, – torpağın üstündə nə vardısa qaçışdılar...

İldırım çaxdı. Bulud neçə yerindən yarıldı. Uca binaları az qala buluda dirənən şəhərin camaatı bir-birinə qarışa-qarışa ora-bura doluşdu... Yuxarıdan baxanda ardı-arası kəsilmədən axışan maşınlar təsbeh düzümünə bənzədi.

Topa bulud yun kimi çırpıldı, içi-çölü açıldı, canından iri-iri damcılar düşdü. Nağıl danışanın sözüylə desək, buluddan düşən damcılar yer üzünə çatanda gördük ki, damçı deyil, sudan düzəldilmiş dupduru, apaydın, bapbalaca uşaqlardı...

Balıqlar suda, ağaclar meşədə, çiçəklər düzdə yağış uşaqlarını qarşılamağa çıxmışdı. Yağış uşaqlar çığırışa-çığırışa tökülüşürdülər. Biri yarıyacan sudan qırağa çıxmış balığın burnunun ucuna düşdü. Balıq, Yağış uşaq da burnunun ucunda suyun altıyla gedirdi. Suyun dibi Yağış uşağın gəlişiylə işıqlanmışdı. Yağış uşaq get-gedə rəngini dəyişir, kəhrabaya dönüb işıq saçırdı.

Meşəyə tökülən Yağış uşaqlar şərqi oxuya-oxuya ağacları, yarpaqları, talada otlayan kəhər atı yuyub, təmizləyirdilər...

Çiçəklər ləçəklərini açmışdı, Yağış uşaqlar iki bir, üç bir çiçəklərin qoynuna düşdü. Çiçəklər həsrətlə onları bağrına basdı, qucaqlaşdılar.

Bayaq buludu görüb gərnəşən torpaq gülümsəyirdi, hər yan işıq içindəydi... Elə bil İl-Ay bayramıydı, canlı-cansız nə vardısa oyun çıxardırdı.

Dovşanlar Yağış uşaqlar da bellərində o yamacdan bu yamaca qaçırdılar.

Kirpilər bir açıqlıqda başlarını içlərindən çıxartmışdılar, yağış uşaqlar tikanlara batmasınlar deyə, çataçatda yollarını dəyişib kirpilərin başına qonurdular. Hər kirpinin başına yüzlərcə Yağış uşaq qonmuşdu.

Bir yamacda Yağış uşaqlar canavarı çimizdirirdilər...

Yağış uşaqlar şəhərə də yağırdı.

Amma şəhərin havasından keçəndə Yağış uşaqların rəngi qaraldı. Bir binanın üstündə Yağış uşaqlar bir-birinin üz-gözünü təmizləyirdi. Sonra binanı təmizləməyə başladılar...

Bir ev uşağı əlini pəncərədən çıxartmışdı. Ovcuna Yağış uşaqlar düşürdü. Ev uşağının əlinin içi yarpaq kimi təmiz, dinc idi.

Bir əl hirslə uşağı çəkib pəncərəni bağladı. Uşağın ovcundakı Yağış uşaqlar asfalta dəyib parçalandılar, tez də bir-birindən yapışıb səkinin dibiylə axdılar.

Bayaq təsbeh dənələrinə bənzəyən maşın qatarı yenə bir-birinin acığına, bəhsinə keçib getməkdəydilər. Şərqilər oxuya-oxuya asfalt yolu yuyan Yağış uşaqlarsa təkərlərin altında qalıb çığırışa-çığırışa qırağa dağılışırdı...

Uzun saçları kürəyini bürümüş qız qarşıdakı binaya tələsirdi. Yağış uşaqlar qızın saçlarına çəmənliyə tökülürmüş kimi tökülürdü.

Arxadan biri də gəlirdi, amma çətir tutduğuna görə onun üzünü görmürdük. Çətirin üstə düşən yağış uşaqlar sürüşə-sürüşə çətirin qırağınacan gəlir, bir anlığa sallanıb baxırdılar: bığıburma bir kişidi...

Yağış kəsmişdi, göy üzü yuylub apaydın olmuşdu. Şəhər də tərtəmiz idi. Yağış uşaqlar indi yerdə – asfaltın üstəydilər; hərəsi arxasınca çirk, kir bağlaması sürüyə-sürüyə səkilərin dibiylə gedirdilər. Binaların divarları boyu gecikən Yağış uşaqlar da yüklənib ağır-ağır enirdi.

Yer asfalt olduğuna görə hara getdiklərini bilmirdilər. Amma hardan-sa su səsi eşidirdilər, bilmirdilər hardadı. Azala-azala getməkdəydilər.

Səkilərin qıraqlarında ağaclar vardı, ağacları duyduqlarından bir-birinin çiyininə çıxıb özlərini ağaclara çatdırmaq istəyirdilər. Getdilər-getdilər, bir əl yollarını kəsdi, dönüb başqa yerə axdılar.

Aşağıda asfalt örtüklərin ortasında bir parça torpaq gördülər, üstünün çiçəkləri ləçək yelləyə-yelləyə Yağış uşaqları çağırırdı...

## XII hekayət

Oğru öskürəyi. (Nağıl-film)

*(El arasında "oğru öskürəyi" ifadəsi var. Sürü oğrunun gəldiyini hiss edəndə içini vura-vura çobana bildirir. Buna "oğru öskürəyi" deyirlər... Bir də canavar adətən oğrunun kölgəsinə girib sürüyə girər, istədiyini götürər. Ay arxadan düşdüyü üçün oğrunun kölgəsi özündən çox-çox qabaq sürüyə çatar. Canavarın ovu oğrunun kölgəsinə girib gizləndiyinə görə uğurlu olar. Nağıl-filmimiz bu mövzuya həsr olunub)*

Yalquzaq da boz idi, təpəliklər də, ona görə yalquzaq yerdən-göydən seçilmirdi. Neçə gündü acdı, amma hardansa, nədənsə ağzında dad-tam vardı, ağzı dada gəlmişdi. Yaddaşına tam damcılayırdı... nəsə yeyəcəkdi. Beləcə, bozümtul qayaların arasında ruzusunu gözləyirdi.

Neçə gündü dağ dələn, xırmanda darı seçən gözləriylə dörd yanı seyr eləyirdi ki, nə ruzusudu bu? Bu ov hardan gəlməlidi, kim gətirməlidi?!

Axşam düşmüşdü. Sürülər arxaca axışır, çoban itlərinin dözüm daşıyan səsləri yaylaq qaranlıqlarına təskinlik, toxdaqlıq vəd eləyirdi...

İnsanların tamahı ayaq üstəydi, hərəni bir yana dartırdı... Elə də oldu, gecə yarını ötəndən sonra hərə öz tamahının dalınca düşdü. Əl əldən uzun olmuşdu. Dünyanın varı tamaha yüklənirdi. Gün çıxanacan azın azından, çoxun çoxundan götürməliydilər. Bağ oğrusu bağa, dağ oğrusu dağa getdi...

Kökələr yağlanmaqda, karvanlar saxlanmaqdaydı; dövləti daşan, cibləri şişən vardı, halallar aldan keçirdi, haramlar əldən. Halalın gözündən, doğrunun üzündən uzaq, nə gedirdi bağdan gedirdi...

Nə isə, bizim nağılımız Yalquzaqdandı... Görək bu gethagetdə ruzusunu, qismətini gözləyən Yalquzaq neynədi?

Qorqud Dədə demiş, *qaranqu düşmüş, qurdun bəxti* oyanmışdı...

Ay doğdu, gecənin qoynuna nur çiləndi, elə bil. Ay doğan kimi sürüyə yaxınlaşan oğrunun kölgəsi canavarın üstündən aşıb sürünün ətəyinəcən uzandı. Canavarın ağzını dada gətirən tam, ruzu elə bu yoldaymış; oğrunun kölgəsiylə gedib sürüyə girdi. Onu da bilirdi ki, ən kök, ən yağlı heyvan sürüdən qıraqda yatar; ən qıraqda yatanını tutub arxacdan çıxartdı...

Qayaların arasında ovunu yeyirdi... Üstündən bir kölgə yenə keçdi, bayaqkı oğruydu. Bir qoyunla gözü doymamışdı, yenə gətirməyə gedirdi...

## XIII hekayət

Ceviz qurdunun balası. (Nağıl-film)

Ceviz qurdu balasını yalayıb tüpürcəyinə bükdü, sonra da qoz ağacının qabığının altında gizlətdi... Payız gəlmişdi artıq, meyvələr yığılmış, yarpaqlar tökülmüşdü. Hər şey mənzilinə çatmış kimi görünürdü...

Ceviz qurdunun balası bələkdəydi, ağacın gövdəsi istiydi bu istiyə uyumuşdu. Yazacan da beləcə uyuyacaqdı...

Qoz ağacı çox böyükdü, başı bluddan, ayağı dəryadan nəm çəkirdi.

Dediyim kimi, soyuqlar düşdü. Ceviz qurdunun özü torpağa qarışıb qış yuxusuna getdi, balası da ağacın qabığı altda...

Ağacın başında ceviz qurdlarının yeyib boşaltdıqları beş-altı qoz qabığı qalmışdı, külək əsdikcə boş-boşuna yellənirdi.

Ötən yazdan qalan elə bunlardı. Elin-obanın nağılçısı da bunlara baxıb ona görə dedi:

– Ee-yy, gidi dünya, bir çürük qozcan da deyilmişsən...!

Amma dünya, daha doğrusu, *Varlıq-Gedişat* özü özünü sağaldan, ağrılarını unudandı.

Beləcə, yaz gəldi, hər şey yenidən doğulana oxşadı. Torpaq öz cücərtiləriylə yollara çıxdı yenə. Bütün qışı köklərinə sığınan qoz ağacı da ayılıb özünü cana gətirdi; tumurcuqları içindən-içindən çırtlayıb açıldı...

Hər şey o biri illərdə olduğu kimi gözəldi...

Ceviz qurdunun balası hava dəydikcə, daha doğrusu, bələyi isindikcə böyüyürdü. Hava əslində Vaxt idi, – Tamah, bütün gücü, tutumuyla qurdun balasından keçirdi. Ona görə də qurdun balası, bir anın içində böyüdü. Həə, qurdu böyüdən tamahdı, qurd tamaha böyüyürdü...

Bələyini yırtıb çıxdı, ağacın başında turşməzə dad vardı, bu dad onun içindən canını çəkib çıxardırdı. Ağac yarpaqlamışdı, meyvəsi yaşıl örtük içindəydi, hələ süddüydü, süd qoxuyurdu, sümüyünü bərkitməmişdi. Qurd bu turşməzə qoxuya yeriyirdi, çatıb qozun hələ bərkiməmiş, yaşıl gövdəsinə sancıldı...

Günəş yarpaqların arasından süzülüb qurdun balasını işıqlandırırdı. Hər şey dadlı, doğma, onunku idi. Beləcə, böyüyüb cana-qana gəldi, cevizlər də özünü tutub iriləndi, qorxunu hiss eləyəsi oldu, amma gec idi, qurdun balası qoz bərkiməmiş, hara cancılmışdı ordan içəri girdi...

Bələkdən təzəcə çıxmışdı, nə görmüşdü ki? Arıq, çəlimsiz idi. Amma bilirdi ki, hər şey onundu... Elə girdiyi yerdən söküb yeməyə başladı...

Qozun içi də dünyada olduğu kimiymiş. Arakəsmələri varmış, enişi-yoxuşu, batısı-doğusu, sağı-solu varmış...

Çox tez kökəlib enləndi. Yenə iştahla yediyi bir vaxtda özünün açdığı deşikdən bir qurd yenə gəldi. Çox vaxtında qalxdı, təzə gələni əzib heç elədi. Vaxtı ötürsəydi, gec olacaqdı, qurdun dəqiq bildiyi şeylərdən biri də buydu: *nə qədər toxsan, yerini qoru...*

Yağış yağırdı, qurdun açdığı deşikdən damcılar sürüşüb keçirdi, qurd bundan da ləzzət alırdı, gördü hər şey onundu, sevindiyindən az qaldı ürəyi getsin. Başını çıxardıb boşluqlara doğru uladı.

-Uuuuu-uuuu!

Qurdun boşluq hesab etdiyi aşağılarda nə olmuşdusa, nağılçı əlinin qanını yuyurdu, bir də dedi:

– Gidi dünya, bir çürük qozcan da deyilsənmiş!

Qurd yeyib-içib o qədər kökəlmişdi ki, dərisinə cığmırdı. Cevizin yer üzündəki sərhədlərə bənzəyən arakəsmələrini dağıdıb yeyib-içib toxluğundan hıçqırır, girdiyi deşikdən aşağıları seyr edirdi.

– Uuu-uuu...!

Qoz ağacının boyu uzunu sinirləri titrədi, üstündə nə qədər quş vardı uçub dağılışdılar...

Qurd günlərlə beləcə, toxluğunu yaşadı, acanda özünə gəldi; qozün içi bomboşdu, o baş bu başa getdi, özü bilməsə də, aradan xeyli keçmişdi. Gəldi ki, girdiyi deşikdən çıxsın, heç burnunun ucu da yerləşmədi. özünü bir də deşiyə vurdu, gicəllənib boşalıb külə dönmüş arakəsmələrin üstünə uzandı. Qozün içində yellər əsirdi. Aradan nə qədər keçmişdi bilmədi. Ac idi, yemək istəyirdi, amma küllükdən başqa heç nə yoxdu. Özünü deşiyə bir də çırpdı, çıxa bilmədi.

– Uuuu-uu!

Gözləri baxa-baxa arıqlayıb çöpə döndü. Qozün içinə girəndə nə boydaydısa, təzədən o boyda olub deşikdən çıxdı.

Qurd harda səhv eləmişdi, biləmmədi. Qalxıb heç nə olmamış kimi nəsil artırmağa getdi...

## XIV hekayət

Yalan-doğru

Bir məclisin şirin yerində Adam Aşığın sözünü kəsib sual verdi:

-Aşıq mənə bir yalan danış, həm inanım, həm inanmayım.

Aşıq bi az fikrə gedib dedi:

-Bir düzənliklə gedirdim, nə dağ vardı, nə dərə, nə daş vardı, nə ağac. Günün də günorta vaxtıydı. Birdən göydə küçük hürdü.

-Nə hürdü?!

-Küçük...

-Aşıq, biz sənlə söz damışmışıq. Göydə küçük hürməz.

-Mən də bilirəm hürməz.

-Bəs onda niyə deyirsən? Kimi inandıra bilərsən?

-Bir qartal caynaqlarına bir küçük alıb başımın üstündə dolanırdı. Küçük göydə hürürdü, mən də küçüyün səsinə başımı qaldırdım. Olarmı?

-Olar,- dedi, Adam.- Həm inandım, həm inanmadım.

***

## Fidana məktublar

*I məktub*

Fidan hələ məktəbə getmir, amma yazıb oxumağı bacarır. İlk sözü də mənə yazıb: "Necesən..." Sual işarəsi də qoymayıb. İkinci məktubunda iki söz yazdı, üçüncü məktubunda üç sız. Beləcə, məktuba bənzətməyə başladı. Günlərin birində – baba, sən də mənə məktub yaz, – dedi.

Düz deyirdi, cavab yazmalıydım...

Bütün səmimiyyətimlə deyim ki, yazıçılıq edəndə heç belə çətinliyə düşməmişdim. Bir daha anladım ki, uşağı aldatmaq olmaz, uşaq oyuncağın özünü sevər, oyunbazlığı yox. Daha doğrusu, uşağa oyunbazlığı göstərmək lazım deyil. Yəni, ən ciddi sözünü uşaq üçün deməlisən, ən ciddi həyat tərzi, ən dəqiq vaxt bölgüsü uşaq üçün ayrılmalıdır.

Bütün bunlara görə nəvəmə ilk məktubu yazanda çətinlik çəkdim, axırda belə bir şer yazıldı. Şeir də yəqin ki, söz tapa bilmədiyim üçün yaranmışdı.

Quşdan xəbər aldım səni,
– Fidanı görmüşəm, – dedi.
Başından bir tel istədim,
– Fidana vermişəm, – dedi.

Gül əkdim, tutdu eyvanı;
Bitdi, bürüdü hər yanı.
Elaya dedim: – gül hanı?
– Fidana dərmişəm, – dedi.

Bahar özünü yetirib,
Daşda da yarpaq bitirib.

Fidana çiçək gətirib
– Qapıya sərmişəm, – dedi.

Bilmədim, başlayım nədən,
Bir sözdü, gəldi sinədən.
Fidanı soruşdum nənədən,
– Yuxuda görmüşəm, – dedi.

## II məktub

Sonrakı məktublarda hissi, duyğunu dəyişməliydim. Yoxsa söz tükənərdi. Yəni, şəxsi hisslərdən çıxmalıydıq. Doğma, azad Azərbaycanımızda Fidanlar çoxdu... Söz indi onarın hamısına deyilməliydi. Belə də düşünməyə və çalışıb işləməyə başladım. Tapmacalar, təkərləmələr, düzgülər, yanıltmaclar, hekayətlər yazdım. Tanıdığım, tapındığım *xalq yaradıcılığı yenə köməyimə gəldi..*

## Tap tapmaca...

Xətkeşin iz-iz eylər,
Xətləri dümdüz eylər.
Hansı saydı, toplasaq,
İkini səkkiz eylər.
(cavab: 6)

Tək saylı olan nədi?
Saylara dolan nədi?
İki birdən bir çıxsaq
Yerində qalan nədi?
(cavab: 1)

3 gəlsə 10-a, neylər?
10 getsə sona, neylər?
Birini üstdən aldıq,
Bəs biri yana neylər?
(cavab: 1)

Bir onluq iki 5-dir,
Bir 1-in beşi 5-dir.

Adına nə deyərsən,
Mən desəm 5-i 5-dir...?!
( cavab: beş dənə 1)

## III məktub

Alabəzək 10 quşdu,
Bağımıza qonmuşdu.
Yerdə üçü qalıbsa,
Bəs neçəsi uçmuşdu?
(cavab: 7)

Bir “sən”də bir “s” varsa,
Bir “mən”də neçə “n” var?
Bir 10-da on 1 varsa,
Bir 100-də neçə 10 var?
(cavab: 10)

## IV məktub

Əl-ələ tutub sənlə,
Vərəqləri dolaşır.
Nə səsi var, nə dili,
Amma sənlə danışır...
(cavab: qələm)

Tap tapmaca, tapdınmı?
Durum birin də yazım.
Ata otdu, quşa dən,
Bə, bəbəyə nə lazım?
(cavab: süd)

Buynuzu var ucadan,
Hər şey baxar, bacadan.
Hər nə desən orda var,
Amma heç kəsə verməz,

Sən onu görərsən,
O, səni görməz...
(cavab: televizor)

Dəmir dəmir üstündən,
Hörüyü var tüstüdən.
Soyuq olar, tərpənməz,
Qaçar, gedər istidən...
(cavab: paravoz)

Görsən də görəmməzsən,
Görməsən də görərsən.
Üstündən keçən kimi,
Saçlarını hörərsən...
(cavab: külək)

**V məktub**

Bir quzu elə birdi,
Min yoxlayaq, min sayaq.
Arxaca gələndəsə,
İki baş, səkkiz ayaq.
(cavab: quzu və anası)

On inəkdi, de görüm,
Tövlədən niyə çıxdı?
İkisi su içəndə,
Səkizi göyə çıxdı...
(cavab: göy burda yaşıl çəmənlik mənasındadır)

Bir balıqdı, bir ceyrandı, bir də quş,
Gördüm, bir-bir əl elədim onlara!
Qaçdı, getdi, səsim-ünüm çatmamış,
Balıq suya, ceyran çölə, quş hara?
(cavab: quş göyə)

Səkkiz yöndən nur saçar,
Zülmət ondan gen qaçar.

Üç rəgli, üç boyalı,
Azad, uca, sayalı...!
(cavab: Milli bayrağımız)

**VI məktub**

“Yüyət günü”nün düzgüsü.

Yüyət günü deyəndə nəyi nəzərdə tuturuq?

Yüyət günü, təmizlik günü deməkdir. İndi də bəzi kəndlərimizdə, evlərimizdə-ailələrimizdə az da olsa yaşamaqdadır. Yəni hər evin özünün təmizlik günü, yuynma – yüyət günü olardı.

Bizim ailənin yüyət günü adna günüydü, yəni cümə günü, beşinci gün.

O günün salamlaşmağı da başqa cür idi. Hamı bir-birinə: “Günün yağlı olsun” – deyərdi...

Paltar yuyan, qazan asan, su qızdıran, uşaq çimizdirən qadınlarla ancaq belə salamlaşardılar:

– Günün yağlı olsun!

Analarımız bizi yuyub-yaxıyanda su qarışıq “Yüyət düzgüsü” oxuyardı, bununla da bizi arıdar-duruldardılar. Bu düzgüləri bizim özümüz də əzbərləyər, başımızdan su töküldükcə deyərdik:

Ağırlığım, yağırlığım,
Dağdan axan sellərə,
Küləklrə, yellərə,
Qarğış deyən dillərə,
Yalan, talan əllərə,
Haram yeyənlərə...
Dənizlərə, göllərə,
Öküzlərə, kəllərə,
Axsı-ıın, getsin...

Ağırlığım, yağırlığım,
Göydə uçan quşlara,
Qara-qara daşlara,
Geridə qalmışlara,
Cinə yoluxmuşlara,
Oğruya, oğraşlara,

Axsı-ıın getsin...

Ağırlığım, yağırlığım
Bizə hürən itlərə,
Minilməyən atlara,
Yeyilməyən otlara,
Yağılara, yadlara,
Pis arvadlara
Axsıı-ıın, getsin...

Son uğurlamağı (*son suyu)* analarımız oxuyardı:

Bu su böyütsün səni,
Yusun, eyitsin səni,
Öysün, öyütsün səni...
Sən ananın balası,
İmarəti, qalası,
Su səni təmiz yusun,
Yanınnan axmasın,
Canınnan axsın...

***

**Yaylaq dərslikləri...**

Yarıyaşını çoxdan ötmüş bir ağsaqqaldan soruşdular: – Nə var, nə yox? Səhhətiniz necədi? Dedi: – Yaxınlar uzaq olub. Birlər iki olub. İkilər də üç.

Ağsaqqalın nə demək istədiyini anlamaq üçün xeyli düşünməli olduq. Axır ki, tapdıq. Yəni qocalmışam, yaxınları seçə bilmirəm. Hər şeyi iki görürəm. Ayaqlarım da əlimdəki əsayla bir yerdə olub üç...

***

*El arasında "qurd fəndi"deyilən ivadə var. Qurdun"Oğru kölgəsi"nə girmək fəndiylə tanış olduq. Bir fəndi də Gün şüalarının düşdüyü vaxtlarla bağlıdır...*

*Bunu bilən ağıllı çobanlar axşamüstü sürünü kəndə, obaya gətirəndə adətən elə gələr ki, Gün arxadan düşsün...Günəşə qarşı gələrsə, yəni günün işığı qarşıdan düşərsə sürü heç nə görməz, çobanın da gözü qamaşar, qoyun-quzunun da... Canavar bilir bunu, çoban qarışıq, sürünü*

*güdür, Günəş əyilir, dağların qaşından düşən şüalarla sürüyə girir, sürü də, çoban da, çobanın iti də heç nə görməz, gözləri qamaşar... Günəşin bata-batda olduğu qürub vaxtı bir an çəksə də, bu andan qurd ustalıqla istifadə eləyə bilir, yararlanır. Ona görə də Dədələr deyib: sürünü günə qarşı aparma... işığı qurd gətirər.*

***

Qurdun bir fəndi də çoban itləriylə bağlıdır... Belə deyirlər ki, tayı ölüb yalquzaq olmuş canavarlar yaylaq itlərini səslərindən tanıyırlar. Səslərindən bilirlər ki, hansı itə yaxın düşmək olar, hansı it sərtdi, hansı it yumşaqdı. Beləliklə, istədiklər vaxt yalquzaq canavarlar çoban itlərini yoldan çıxarda da bilirlər. Yaylaq diliylə desək, taylaşırlar, birgə yaşamağa başlayırlar. Yalquzaq itin bələdçiliyiylə sürüyə düşür. Ağıllı çobanlar itdən tez şübhələnməyə başlayırlar. Bunu ilk öncə qoyunların özü bildirir. İt canavarla yaxın olub qayıdanda canavarın qoxusunu gətirir, qoyunlar hürkür. Ona görə ki, itdən canavarın iyi gəlir...

Yaylaq həyatında belə hadisələr çox olub. Bu cür dönük, satılmış itləri elə yerdən asırlar ki, canavara görk olsun. Canavara görk olur, amma o gündən yalquzaqla çobanların arasında açıq müharibə başlayır...

70-ci illərin əvvəllərində yazdığım “Qaraca kişinin yaylaqları” hekayəsini bu mövzuya həsr etmişəm...

Nə qədər yırtıcı olsa da, eldə-obada qurda hörmət, sayqı azalmır. Ona görə ki, qurdun elədikləri açıq-açığınadı, mərdanədi. El-oba deyimindən də bilinir: *“Qurd üzü mübarəkdi”, “Qurdla qiyamətə qaldı”, “Qurd anıldığı yerə gələr”, “Qurd əniyindən it olmaz, yenə qurdoğlu qurd olu...”, “Qurd kimi ağız-ağıza yatırlar...”*

*Deyilənlərə görə bir ağ canavar Oğuz xana döyüş yolunu göstərərmiş, həmişə də qələbələrə apararmış... Əmir Teymur döyüşlərdə “qurd fəndi” işlədərmiş... Qurdun adını çəkməzlər, “ağzıyanmış” deyərlər...*

***

Deyərlər, “küçüyü mahmızından, ili yazınnan tanı”... Mahmız küçüyün qabaq pəncələrinin arxasında olan çıxıntıdı. Usta çobanlar küçük seçəndə mahmızına baxıb seçərlər...

Küçüyü böyütmək üçün, daha doğrusu, yaylaq iti eləmək üçün yaylağın öz dərslikləri var. Öncə, dediyim kimi, küçük vaxtında gərək

seçilsin. Sonra gözləri açılmadan yeraltı qazmaya salınmalıdır... Ona görə də məsəl var: “Gəlini gərdəkdə, küçüyü deşikdə (dəməkdə) saxla...”

Bu da çox yəqin ki, iti küçük vaxtından qaranlığa öyrəşdirmək üçündür. Yeməyini də elə orda deşikdə verirlər. Adına öyrəşsin deyə adını çağırıb vaxtında yeməyini, suyunu deşiyə qoyurlar. Gözləri açılandan sonra küçüyün qorxusunu çıxartmaq qalır... Qorxu çıxartmaq nədir? Küçük hələ qazmada ikən kimisə bəzəyib-düzəyirlər, yəni qalın geyimlərdən geyindirirlər, qorxunc hala gətirirlər. Yiyəsi əlləriylə küçüyün gözlərini örtür ki, işığa birdən-birə baxmasın. Dünyaya gözlərini açanda da ilk dəfə qorxunu görsün. Küçük qorxa-qorxa, hürkə-hürkə ətrafına baxır, istəyir çıxdığı yerə qayıtsın, deşiyin ağzı bağlıdı, artıq. Yiyəsinə sığınmaqdan başqa çarəsi qalmır... Elə bu vaxt bəzənib-düzənmiş Adam qorxunc səslə küçüyün üstünə yeriyir. Küçük çığırıb özünü yiyəsinin üstünə salır. Bu, küçüyün qorxunun nə demək olduğunu bildiyi andır. Yiyəsi də neçə müddətdi bu anı gözləyirdi, ağacını götürüb Qorxuya hücum edir, Qorxu qaçır, küçüyün yiyəsi də dalınca: – Paraq tut, – bu səs küçüyə bəs edir. Yerin altında yaşadığı günlər ərzində adını eşitdiyi doğma səsin nə dediyini anlayır, yerindən götürülür. “Arxalı köpək qurd basar” məsəlini də ona görə deyiblər. Qorxuya çatır, Qorxulu qaraltı da özü bilə-bilə yıxılır, küçük elə bilir bu boyda qorxunu özü yıxdı, daha da qızışıb onu didişdirməyə başlayır. Yiyəsi qorxunu onun əlindən alır, başını tumarlayıb, tərifli sözlər deyir... Bununla da it gələcəyin bütün qorxularına hazır olur...

***

Yaylaq yerində alaçıqların çox zaman qapısı, bacası açıq olur, ya da heç qapısı olmur. İt qaba-qaşığa baş vumasın deyə, küçük vaxtından ağzını yandırırlar...

“Hələ ağzı yanmayıb” deyimi də təsadüfi yaranmayıb. Dediyim kimi, birinci dərs ayağındakı mahmıza baxıb küçüyü seçməkdi, ikinci dərs qazma həyatıdı, üçüncü dərs qorxusunu keçirtmək... Sonra ağzını yandırmaq gəlir. Mis qabı odda qızdırıb, içinə yemək töküb alaçığın qapısı ağzına qoyurlar. Küçük özünü salıb yeməyi yeyəndə ağzını yandırır, zingildəyə-zingildəyə uzaqlaşır.

Acından ölsə də, bir də başını alaçığa salmır...

Qurdbasan itləri xışa öyrədirlər; yəni, üstünə xırda bıçaqlar bərkidilmiş xalta keçirdirlər boynuna. Boynunda xış, bu cür təlim görmüş itlər özlərini çırpmaqla qarşılarına nə çıxdı yaralaya bilirlər...

1990-cı illərdə Amerikada çalışan türk tədqiqatçı-jurnalisti Əhməd Arslan "Oğuz eli" qəzeti"nə bir məqalə vermişdi, yazırdı ki, arxeoloqlar hindular yaşayan ərazilərdə iri, çox böyük boyunbağı tapmışdılar. Mətbuatda bu haqda çox yazılar dərc olundu, mübahisələr, dartışmalar getdi. Əgər, deyirdilər, qadın boyunbağıdırsa, bunu gəzdirən qadının üç metrdən artıq boyu olmalıdır... Mən, – deyir, – Əhməd Arslan boyunbağının şəklini qəzetdə gördüm, tanıdım ki, xışdı, Qars kəndlərində döyüş itlərinin boynuna taxılan xalta-xış. Getdim redaksiyaya belə də dedim, inanmadılar. Redaksiyadan bir müxbir də qoşdular mənə, getdik Qarsa, elə öz kəndimizdən bir neçə dənə xış götürüb qayıtdıq Amerikaya...

Məsəl var: "At qarnından üşüyər, it burnundan". Ona görə də atlar ayaq üstə yatarlar, itlər də quyruqlarıyla burunlarını örtəndən sonra. Böyüklərimiz itlərin quyruqlarını da bu səbəbdən kəsirdilər ki, yatmasınlar, sürüləri qorusunlar... Quyruqsuz itlərə də *xola* deyərdilər..

Çox vaxt da quyruqlarının ucunu qatdayıb qırla yapışdırırdılar. Bu cür itlərə Çəmbər adı verərdilər. Deyərlər, iti aldatma; bir dəfə çağırdın, gəldi, bilsin ki, nəyə görə çağırdın, yanında verməyə yemək olmasa da başını tumarla ki, bir də çağıranda nəyə gəldiyini bilsin.

Türk həyat tərzində, anlayışında atla it insanın ən yaxın dostudur. Bu, onun düşüncəsində, yaratdıqlarında, adət-ənənəsində sazında-sözündə yaşamaqdadır...

## Arı otu

Deyərlər, arı beçə verəndə əsgi yandırıb tüstüsünü arıya verərlər, yanında tütəkçi tütək çalar, beçələr səsə yığışıb bir-birinə sarına-sarına asılıb qalarlar.

Beçə qaçanda tənəkə döyürlər, göyə papaq atırlar. Ana arı hardadı, beçələr ora yığılar. Arı otu var, o otdan dərib əlində tutsan ana arı üstünə qonacaq, beçəsi də ardınca...

Belə deyirlər ki, kandalaşın meyvəsi qaralanda balı çəkməyə başlayırlar. Adətdi, təzə gəlini əlində bir qab balla gətirərlər. Gəlin əlini bala batırıb keçdiyi qapıya vurur. Qaynana gəlinin başı üstündə çörəyi ailənin sayı qədər bölür, evdəkilərə verir, hərə qismətini gəlinin əlindəki bala batırıb yeyir ki, arada şirinlik olsun...

Baxmayaraq el arasında belə bir ifadə də işlədilir: " Elə gəlin var, qapıdan bir batman balla girsə də xeyri yoxdur".

Deyərlər, Günəş çıxanda da, batanda da yer-yurd üzünü Günəşin ardınca çevirər. Gün batandan sonrakı vaxtın adı **“Darçağı”**dır.

Dədələr deyər, “vaxtdan giley eləmə, vaxtın gedər”. “Torpaq qızıl quşdu, deyərlər, əlindən uçurtma”.

Deyərlər “dar vaxtı”nda itini açma, qonağın gələ bilər.

Deyərlər, “ilin-ayın da yeləni var, bələni var, gəzi var, yayı, yazı, qışı, küzü var”.

“Yelən” burda sınır-sərhəd mənasındadır, yəni, ilin əvvəli, qırağı. Misal üçün, xalçanın yeləni. Yelən ən çox gəlağayılar və xalçalar üçün işlədilir. Deyərlər, yelənsiz xalça olmaz.

“İlin yeləni..” deyəndə, yəni, işini vaxtında gör. “Bələni var”, yəni aşırımları, çətinlikləri. “Gəzi var”, burda dövr-dövran mənasında işlədilib. Yəni işini vaxtında gör ki, bəhrəsini də görəsən...

**Bayatılar**

Dağların göy çəməni,
Göyərər göy çəməni.
Ya mən yarı taparam,
Ya vurar, oyçu (ovçu) məni...

Xoruzun dan səsinə,
Oyandım ban səsinə.
Yarım çağırdı məni,
Demədim can səsinə...

Verdiyinə...
Şükr olsun verdiyinə.
Verirsə Tanrı versin,

***

Bütün bunlara görə, qısaca son qənaətimi deyim; bizim yaşayış tərzimiz, baxışlarımız, yəni, özümüz yaratmış kimi təbiət hadisələrinə ərk eləməyimiz, bizə üstünlük gətirib həmişə. Yuxarıda dediyim **bəşəri, insani münasibətlərlə yanaşı,** qaranlığı, işığı, gecəni-gündüzü, yeri-göyü canlı duyğu kimi anlayıb söz deməyimiz, mahnılar bəstələməyimiz əslində bizim xalqın yaratdığı fəlsəfədir. Bizim fəlsəfəmizdir, bunu belə dəyərləndirməliyik... Ona görə də folklorumuz, onun xüsusi qolu olan

*aşıq yaradıcılığı, – SAZ, minilliklər boyu yalnız ermənilərin yox, bir çox xalqların, bizi əhatə edib bizə xor baxanların, istər içimizdə olsun, istər çölümüzdə, yaddaşını incidən, onu öz milli hikkəsinə sıxışdırıb dəyişikliklərə uğradan gücümüzün ifadəsidir.*

**Alaşa...**

*Bir kişinin bir atı vardı, dolanışını bu atnan çıxardırdı, bazarda işlədirdi, ora yük aparırdı, bura yük aparırdı. Kişi qocalmışdı, artıq, necə deyərlər, beş-beş çıxdığını bir-bir enirdi. Arpa bahaydı, atı samanla saxlayırdılar. Saman atı da elə gendən manşırdı, canını gəzdirirdi. Birdən-birə dilə gəlmiş olsaydı, birinci sözü arpa olardı. Ata da, oğul da bir balaca sinədən söz deyən idi, hərəsinin bir sazı vardı, dara düşəndə deyişirdilər. Günlərin birində anası oğluna dedi:*

*– Oğul, gələndə bazardan bir batman duz al, gətir.*

*Oğlu da qayıdanda bar batman duz aldı, qoydu atın üstünə. Gəlha-gəl, yolun yarısında atın dizləri qatdandı, bu ilmi ölübsən, bildirmi... Oğlanın əli bir yana çatmadı, alaşa canını tapşırdı. Çulunu, aldığını belinə götürüb gəldi evə. Atası da həyətdəydi,oğlunu görcək, bildi ki, at ölüb. Dönüb arvadına dedi: – Sazı gətir. Arvad sazı gətirdi. Kişi sazın kökünü yoxladı, gördü elə "Urfanı" üstədi, aldı görək, nə dedi, necə dedi:*

*Oğul,*
*Günün bu çağında səni xoş gördük,*
*Aldınmı canını boz alaşanın?*
*Bayaq çul üstəydin, indi çul altda,*
*De, nəydi dərmanı boz alaşanın.*

*Oğlu bir istədi, atasına cavab verməsin, daha da qızışdırmasın aranı, baxdı yox, ürəyinə bir-iki qatar söz kəlib, gərək deyə. Bir anasına baxdı, bir atasına, dirəkdən sazı asılmışdı, götürüb dedi:*

*Yüyəni sürüşüb çıxdı ağzınnan,*
*Götürüb qaldırdım qantarğasınnan.*
*Gərək yaxşı çıxaq onun yasınnan,*
*Bu oldu "fərmanı" boz alaşanın.*

*Kişi acığındanmı, nədənsə, oğlunun nə dediyini yaxşı anlaya bilmədi, istədi sazı atıb sınmazı götürsün. Şeytana lənət, sazı basdı sinəsinə görək day nə dedi:*

*Sənnən oğul olmaz, mənnən də ata,*
*Heç dəyişərdimmi onu Qırata.*
*Götürüb sınmazı vurasan yata,*
*Alasan qanını boz alaşanın.*

*Oğlu gördü, atası daha da hirslənib, sözdən yan keçir, sınmaz-zad deyir, sazı da düz vurmur. Dedi:*

*Qışda verəmmədik ələfdən, otdan,*
*Bizə əziz idi, qohumnan, yaddan.*
*Arpa deyə-deyə getdi həyatdan,*
*Az oldu samanı boz alaşanın...*

*Arvad bayaqdan baxırdı, gördü atalı-oğullu çox uzatdılar. Əri sinədən söz deyən, oğlu söz deyən, arvad da öyrənmişdi, arada bir onun da deməyi vardı. Deyimmi, deməyimmi; ömründən-günündən də narazıydı. Bir addım irəli yeriyib:*

*– Dayanın! – dedi.*

*Əri də əl saxladı, oğlu da. İstədi birinin sazını alıb sazla desin, ustadlar sözü, saçından üç tel ayırıb basdı sinəsinə, ərinə üz tutub görək nə dedi:*

*Axşamnan bilirdim, çıxmaz səhərə,*
*Mən nə gün görmüşəm, o nə gün görə.*
*Öldürdün acınnan göz görə-görə,*
*Sən oldun yamanı boz alaşanın...*

*Söz tamama yetişdi, onlar yedi-içdi yerə keçdi, biz* ***dörə*** *keçək...*

***

Saz da, bir çox muğam əsərlərimiz də, bizə adi görünən qala divarlarımız da, dəvə, at, qoç qəbirüstü heykəllərimiz də milli abidələrimizdəndir, daş üstə qalmış yazımız kimi daşıdığımız, yaşadığımız məna və mahiyyətimizdir. Ona görə bu səmtə – bu yönə indinin özündə də hücumlar ara vermir. Fərq budur ki, abidələrimiz əl çatan, göz görən olduğu

üçün dağıdıldı, xarabalıqlarına qədər yer üzündən silindi; müsəlmançılığımızdan ustalıqla istifadə olundu, – xristian abidələridir, deyə ad qoydular, mənimsədilər, mənimsəyə bilmədiklərinisə, – kafir ocağıdı, məhv edin, – dedilər. Biz də yüzilliklər boyu "Urra" deyib hücuma keçdik, nə yaratmışdıqsa əlimizə keçəni məhv elədik: dəvə, qoç, at qəbirüstü abidələri sındırıb içində qızıl axtarmağa başladıq, çünki yaxın qonşular ortaya belə bir fikir atmışdılar; *bu heykəllərin içində qızıl gizlədilib.*

Təpə dediyimiz kurqanlarımızı bir tərəfdən də biz dağıtdıq, – yiyəsi yoxdur, ya da *Şaman* yuvasıdır, deyə-deyə gözdən saldıq. Amma yaratdıqlarımız təkcə bunlardan ibarət deyildi, BÖYÜKLƏRİMİZ, USTADLARIMIZ tərəfindən iç dünyamıza, yaddaşımıza yazılmış tariximiz özümüzdən asılı olmadan yaşadı və bizi də yaşatdı... Qonşuların əli yaddaşımıza çatmadı, saz da, muğam da yaddaşımızda, ruhumuzda olduğu üçün məhv etmək mümkün olmadı... Həmişə yaratdıq, yaşamağa davam etdik!

Yeri gəlmişkən bir məsləni də açıqlayım. El arasında belə qarğışlar, söyüşlər qalmaqdadır: *"Kül təpənə", "Təpənə küllər", "Babanın təpəsinə..."* bu kimi misal yenə də tapmaq mümkündür. Fikrimcə bu ifadələr də elə-belə yaranmayıb, çox **köklü**, əsaslı mənalara söykənir. Mənim qənaətimə görə bu söyüş, qarğış ifadə edən "təpə" sözü *təpəliklər anlayışından başqa mənada da işlədilir. İslamdan öncə bir çox türk* tayfaları dəfn mərasimini fərqli yerinə yetirirdilər. Dünyasını dəyişənlərin qəbri yerdən seçilənəcən qaldırılırdı, kiçik təpəcik olana qədər torpaq, kül tökülürdü. Bu adət Çar skiflərdə geniş yayılmışdı. Hörmətli alimimiz Zaur Həsənov çox dəyərli "Çar skiflər" əsərində olan-qalan mövcud dünya elminə əsaslanaraq bu haqda geniş, dəyərli bilgilər vermişdir. Yeri gəldikcə bu mövzuya qayıdılacaq...

## Qonaq və xəsis arvad...

Günlərin birində biri uzaq yoldan gəlirdi, bir kəndin ucqarında bir qapını döyür: – bəs, Allah qonağıyam, qonaq almazsanmı? Ev yiyəsi çıxır: – buyur, qardaş buyur. Qonağa da qurban gəldiyi yollara da... Ev yiyəsinin də bir arvadıymış, bir özü. Arvad da qonağın bəxtindən çox göy-bərk, yəni xəsismiş, "armud qurusunnan su çıxarmış, ondan yox..." Nə isə... arvad qazanda qaz bişirirmiş. Qonağı görən kimi qazanı qaz qarışıq gizlədir. Sac asıb buğda çörəyi bişirirmiş, onu da gizlədir. Qonaq

dediyimiz kimi ağıllıydı, gözünün ucuyla bunları gördü, ürəyində dedi, yaxşı...

Arvad çar-naçar süfrə açdı, süfrəyə darı çörəyi qoydu. Qonaq ac idi, boğula-boğula bir-iki qismət yedi, artıq yeyə bilmədi. İlan vuran yatar, ac yatmaz, deyərlər, yata bimədi. Gecənin bir aləmində gördü səs-səmir yoxdu, kişi də, arvad da yatıb. Durdu ayağa, zil qaranlıq idi, divardan tuta-tuta getdi, çörəyi çıxardıb dağarcığına qoydu, qazandan qazı çıxardıb onu da qoydu dağarcığa. Qapının küncündə bir pipiyi qanlı xoruzları vardı, onu da götürdü. Ev yiyəsi özünə təzə çarıq tikib xoruzun çıxdığı tardan asmışdı, açıb ayağına geyindi, çarığın üstündə biz vardı, onu da çıxardıb yaxasına taxdı. Gördü hər şey qaydasındadı, fikirləşdi ki, belə getmək yaxşı olmaz, kişini oyadım, sağollaşım gedim. Bir sağa öskürdü, bir sola, kişini oyatdı. Kişi baxdı, gördü qonaq ayaq üstədi:

– Qonaq, niyə tez durmusan, nolub?

Qonaq dedi:

– Sözdən-söhbətdən eləyək, bəsdi yatdıq.

Kişi dedi:

-Gecənin yarısıdı, nə söhbət?

Qonaq dedi:

-Neçə yaşın var, bayaqdan fikirləşirəm, bilmirəm, sənmi böyük olarsan, mənmi?

Kişi dedi:

– Əşşi, qoy yataq, yuxuluyam mən, deyəmmərəm.

Qonaq dedi:

– Yaxşı, Qaz xan Qazan qalasınnan çıxıb Dağar qalasına gedəndə sən vardınmı?

Kişi dedi:

– Yox əşi, o vaxt heç nənəmin nənəsi də olmayıb.

Qonaq dedi:

– Onda mən divardan tuta-tuta təknədən çörək götürürdüm. Hə, mən sözümü dedim, sən deyəmmədin, indi izin ver mən gedim.

– Qonaq, sən ala-bula danışırsan, bir şey anlamıram, belə yaxşı deyil, gözlə, heç olmasa qoy xoruz banlasın, xoruz banında gedərsən.

Qonaq dedi:

– Xoruz banlayar-banlayar, banlamaz gedib yolda banlayar. Mən getdim, salamat qal. Axtararsan bizi, tapmasan bizi, halal elə bizi. – deyib yola düşdü.

İşıqlaşar işıqlaşmaz kişi arvadı səslədi ki, qonaq gedib, dur qazanı as, axşamnan acıq.

Arvad dedi:

– Qoy xoruz banlasın.

Çox gözlədilər, gördülər xoruzun səsi çıxmır. Durdular, baxdılar ki, xoruz yoxdu, tavaya baxdılar, çörək yoxdu, qazana baxdılar qaz yoxdu. Kişi istədi təzə çarığını geyinsin qonağın ardınca yola çıxsın, çarığını da tapmadı, arvadına dedi:

– Qonaq apardı, Gedəndə də halallıq istəyirmiş mənnən... halal xoşu olsun. *"Malını yeməzin malını yeyərlər"*.

***Tap tapmaca,***
*Gül qoqqaca,*
*Dizi bayırda,*
*Buynuzu haça...*
(açması **çəyirtgə)**

Ay doğdu Alıstannan,
Gün doğdu Gülüstannan,
Bir gün bir meyvə tapdım
Yeddi illik bostannan...
(açması **yeralması...)**

Yer küpə,
Yeriməz küpə.
Min il qala, çürüməz küpə...
(açması **addır,** dağa-daşa, insana verilən **Ad.)**

Ellər yuxarıda,
Sellər aşağıda,
Su qurşaqda,
Toz qopur, amma...
(açması **dəyirman...)**

***

Təəssüflə də olsa, etiraf edək ki, bizdən, – nəsil nəcabətimizdən, soyumuzdan keçib gedən rus-sovet məktəbləri hardasa yaddaşımıza da yol tapdı, müəyyən mənada bizi bizdən ayırıb yaddaşsızlığa gətirib çıxarda bildi... Əlimizdə olanlara, yaddaşımızda qalanlara dəyər vemədik, başımızı qaldıran kimi qonşuya cumduq. O məktəb öz işini yaxşı bilirdi. Bilirdi ki, bizə nəyi öyrətməlidi; daha doğrusu, nəyi öyrətməməlidi. Proqramı vardı, özünə dediklərini bizə demək olmazdı; onun dərsliyi ayrı idi,

bizim dərsliyimiz ayrı. Ona deyirdi: *“hər şey sənindi, bütün gördüklərini sən yaratmısan, sən də sahib durmalısan”.* Bizə: *“Sən yoxsan, deyirdi. Gəlməsən, hər yerə gəlməsən”.* Məktəblərimizin hamısında dərsliklər bunu dedi: *“Adı yox, yazısı yox”...* Öz müəllimlərimizə də bunu dedirtdilər. Bunu deməyənlər Sibirə sürgün olundu, güllələndi, ac qaldı, xalq düşməni adlandırıldı: “*De, de ki, türk deyiləm, de ki, heç türk olmamışam, olmaq da istəmirəm de. De ki, müsəlmanam!” ...Bir türkün “müsəlmanam” deməyi onun sağ qalması üçün yetərli idi. Özünə türk demirsə, bəsimizdi; sovet məktəbində dərs deyə bilər.* Dedirtdilər... sonra da, indi dərs deyə bilərsən, buyur, keç! Məktəb qapıları açıqdı...

Bizim heç nəyimiz yoxmuş... Doğrudan da, varımızdırsa, indi, lap müstəqillik dövrümüzdə də tikdiyimiz obyektlərə, ticarət mərkəzlərinə şadlıq saraylarımıza niyə ad tapa bilmirik? “Favorit”, “Monte Karlo”, “Monte Kristo”, “Flaminqo”, “İmperial”, “İmperator” və s...və ilaxır, minlərlə bu cür misallar çəkə bilərik, çünki biz rus-sovet məktəbini bitirmişik, təsdiq etməliyik ki, *hər yerə hardansa gəlmişik...* Özünə, sözünə yiyilik etməyənin, sayqı göstərməyənin heç vaxt, heç yerdə hörməti olmaz.

## Qaşqa Sərdar təpəsi – kurqanı...

1950-ci illərin ortaları olardı... Atlı-arabalı Oy dərəsiylə (əslində Ov dərəsidi, eşitdiyim kimi yazmaq istədiyim üçün bu variantı götürdüm) gedirdik. Mən arabada Nənəmin dizinin dibində oturmuşdum.

– Bax, o görünən, – dedi, Nənəm, bizdən bir az aralı, əllə düzəldilmiş kimi səliqə sahmanlı balaca bir təpəni göstərdi, – Sərdar təpəsidi, nağılını danışım eşit, gör niyə adına Qaşqa Sərdar təpəsi deyirlər... Həə, vaxtın nə vaxtıdı, deyə bilmərəm, amma çox da uzun zamanların sözü deyil. Mənim nənəmin nənəsinnən də qabaqların sözüdü...

Nə isə, söz vaxtına çəkər, yayın son ayıydı, yaylaqdan bir köç enirdi, elə bizimki kimi balaca köç idi, kəl arabasında oğul-uşaq gedirdi. Atlılar vardı, naxırlar, sürülər sürülüb yol gedirdi. Axşam çağıydı, elə bu Oy dərəsinnən keçirdilər. Oy dərəsi də indiki kimi deyildi, adam boyunnan da hündür asırğalları, baldırğanları olan, böyürtikənli, qaratikanlı, sarmaşıqlı, kol-kos içində bir yer idi. Nə cür desən ov olardı, addı-sannı ovçular da gəlib burda ov eləyərdilər. Köç Oy dərəsinnən keçəndə arabadan südəmər bir oğlan uşağı yatdığı yerinnən sürüşüb otluğa düşür, heç kəsin xəbəri olmur. Araba uzaqlaşır, yaylaq qaranlığı düşür, gecənin bir vaxtın-

da uşaq oyanıb ağlayır... Yenicə doğduğu balasını itirmiş bir ana maral uşağın səsini balasının səsinə oxşadır, ağacların, kolluğun arasından çıxıb gəlib düz uşağın yanındaca yatır, uşaq elə bilir anasıdı, iməkləyə-iməkləyə gəlib maralın qoynuna girir... Beləcə, Oy dərəsinin cəngəlliyində ana-bala yaşamağa başlayırlar...

...Belə deyirlər ki, günlərin birində ovçular uşaqla maralı görürlər... Maral qaçıb canını qurtarmaq istəyir, amma uşağı qoyub gedə bilmir. Beləcə, elə-obaya xəbər yayılır. Maralı izləməyə başlayırlar. Amma incitmirlər, vaxt keçir, oğlan ayaq tutur, böyüyür, elə olur ki, anasınnan da bərk qaçır...

El-oba gənəşiyə-məsləhətə yığışır... Qərara alırlar ki, Marala dəyməsinlər, oglanı tutsunlar, ev uşagı eləyib əhilləşdirsinlər...

Günlərin birində bir dəstə atlı kəmənd atıb uşagı tuturlar. Görürlər ki, uşağın alnınnan başının ortasınacan tük yoxdu. Maral tez-tez yaladığına görə tük bitməyib. Adına Qaşqa deyirlər; Qaşqa Sərdar...

Maral uşaqdan əl çəkmir, uşağın ardınca kəndə gəlir, heç kəs marala toxunmur, kəndin ot tayasının dibində günlərlə uşağı gözləyirmiş...

Qaşqa Sərdar böyüyür, iğid oglan olur, eldə-obada ad-san qazanır, ona analıq eləmiş Maralı da unutmur, öz evində saxlayır. Maralın xətrinə Oy dərəsindəki maralların da qış, yaz otunu suyunu verir...

Bax, bu **təpəcik** Qaşqa Sərdarın dünyasını dəyişənnən sonra yatdığı yerdi. Elə-obaya yaxşılıqları çox olduğuna görə, yığışıb ona təpə qurdular... Yadında saxla, bu **qurulu təpənin** yanınnan elə belə keçmə...

Nənəm belə deyib əlini üzünə çəkib salavat çevirdi... Beləcə, hamımız səfə düzülüb **kurqana baş əydik...**

***

Biz əslində yerinə-yurduna quş kimi bağlı olan insanlarıq. Evimizi-eşiyimizi quş kimi dimdiyimizdə daşıyıb qurub yaradanıq. Ona görə də, yaşadığımız hər qarış yerin də adı var. Əlimizi hara uzadırıq, tarixin hansı yerinə ayaq qoyuruq tanış gəlməyi də təsadüfi deyil.

**Minilliklər boyu çox acılar yaşasaq da, bu gün ağrılarımızı azaldıb əsəblərimizi sahmana salan, çiyinlərimizdəki yiyəsizlik yükünü götürüb başımızı dikəldən, aldığımız nəfəsə belə dinclik gətirən Müstəqilliyimizə, Üçrəngli Bayrağımıza şükür!**

Bununla belə, klassik yaradıcılığımızda da ayrıca Azərbaycana aid əsərlər çox azdır, o qədər azdır ki, yoxdur, demək mümkündür. Bəzi qaynaqlarda, mənbələrdə adı çəkilib, vəssalam. Belə də olmalıydı; min

illiklər boyu indiki biz, yəni müasir Azərbaycan türkləri bir zamanların imperatorluqlarını idarə edən güc birləşmələrinin tərkib hissəsi idik, ara-sıra bu şəkildə də xatırlanırıq... Tarixin müxtəlif dövrlərində, hətta b.e. öncə IV-X-XX minilliklərdə müstəqil dövlətlər kimi mövcud olmuşuq. Quttubilər, lullubilər, Midiya-Maday, Manna, Atrapatena, Xəzər İmperatorluğu, Alban dövləti, Qafqaz Albaniyası... sonuncu imperatorluğumuz olan Səfəvilər dövlətidir ki, bəzi tarixi qaynaqlarda adına Qızılbaş Midiyası və yaxud Kiçik Midiya da deyilib. Məqsədim bütün bunlar haqda yazmaq deyil. Yalnız onu qeyd etmək istərdim; bu qədər imperatorluqlardan indiyə çox az iz qalıb, daha doğrusu, o çağlardan qalan izləri itirməyə, məhv etməyə niyə məcbur olmuşuq...

Amma bir gerçəyi dərk etməliyik ki, bizi əhatə edən qonşu xalqların dünyagörüşündə, yaşam tərzində, danışdığı dildə, geydiyi geyimdə, yediyi yeməkdə özünü göstərən izimiz, dəyərlərimiz, bir sözlə **Böyük təsirimiz** düşünürəm ki, elə o çağların, islamdan öncəki zamanların təsiridir. Bunu bu gün **qanlar bahasına qazandığımız Müstəqillik** dövrümüzdə anlamalıyıq. Bu, danılmaz faktdır ki, uzun yüzilliklər, minilliklər boyu islam dininin təsiri altında yaşadıq və yaşamaqdayıq. Təsir altda yaşamaqla təsir etmək mümkün olsa da, çətin məsələdir. Bu da faktdır!

Bu da faktdır ki, mübarək islam dinini anlayıb, sevib ruhumuzla itaət etsək də, bilməliyik ki, biz bir xalq kimi **iclam dininə qədər də yüksək səviyyələr yaşamışıq, istər siyasi, istər ictimai mənalarda, yaşayıb yaratmışıq, yaratdıqlarımızla istilalarda itib-batmaqdan qorunub yad tapdağından sağ-əsən çıxmışıq**...

Bu mövzu da Yer üzünə yazılası çox vacib məktublardandır ki, hələ də yolunu gözləyir. Doğrudan da, adına istila, – dini istila desək də, MÜBARƏK İSLAM DİNİ *TÜRK DÜNYASINA, – türk olaraq harda varıq ora,* özüylə gətirdiyi tarixi yeniliklərlə bizi istədiyi şəkildə dəyişə-dəyişə yaşadı və indi də yaşamaqdadır. Yeniliklərsə köhnəliyi məhv etməsə, ayağını olanların xarabalıqları üzərinə qoymasa, yaşamır. İslam dini istila kimi gəlsə də, işıq, hava, su təki hamımızın ola bildi, çünki o da təbiət hadisəsiydi, o da varlıqdan doğmuşdu, minilliklər boyu yaratdığımız mədəniyyət qatlarını da öz içinə alıb gücləndi, mahiyyətimizdə, mənamızda bizim üçün doğma olsa da, özünə yad olan və yad görünən hər şeyi dəyişdi, düşüncəmizdən tutmuş adımıza, geyimimizəcən dəyişdi.

Bütün bunlarla yanaşı dini baxışlarımız demək olar ki, **Tanrıçılığın** əsaslarından o qədər də yayınmadı. Tanrıçılığın sağlam anlayışlarını, tanrıçılıqla bağlı inanclarını qoruyub saxladı. Tanrıya necə inanırdısa, Allaha da elə inandı. Tanrıçılığa görə Su onun and yeriydi, Ucalıq and yeriydi; məsələn, uca dağlara tıapınmağı vardı, görəndə bağır basıb baş

əyirdi. İslamı qəbul edəndən sonra isə əlini üzünə çəkib salavat cevirdi... Ona elə gəldi ki, əslində heç nə dəyişməyib, **YARADANIN** sadəcə adı dəyişib, vəssalam... Amma hər halda Tanrıyla Allahın arasında az da olsa fərq vardı, o fərqi **Xalq** elmi izahlarla yox, ruhuyla hiss etdiyinə görə, bütün bunları yaşada bildi, indi də yaşatmaqdadır...

Ustad aşıq Hüseyn Saraçlını da yuxarıda ona görə xatırladım... Məlumdur ki, vaxtın müəyyən vaxtlarında islam dini tərəfindən çalıb oxumaq, **aşıqlıq eləmək qadağan olundu;** dediyim fərq bu cür məsələlərdə, mənalardaydı. Bu fərqlərsə islam dininin kökündən, mahiyyətindən yox, bizi sevməyən hər hansı bir din xadimindən gəlirdi...

Bu Xalq öz yaşam tərzini də islam dini qaydaları üzrə demək olar ki, dəyişmədi, dini dairələri nəzərə almasaq, min illiklər boyu necə yaşamışdısa, elə də yaşamağında oldu...

## Çobanla minbər...

Günlərin birində bir çoban sürüsünü yaylaqdan endərdi. Kənddə gördüyünə məəttəl qaldı. Minbəri birinci kərə görürdü; o, yaylaqda olanda obada minarəli məscid tikmişdilər, görməmişdi. Ona görə sürünü də saxlayıb mat-məətəl minbərə baxırdı. Ondan-bundan soruşdu:

– Bu nədi? Nəyin nəsidi?

Dedilər:

– Minbərdi.

Dedi:

– Bəs minbərdəki kimdi? Nə deyir? Oxuduğu nədi?

Dedilər:

– Molladı, əzan çəkir.

– Əzandı, nədi, onun dediklərinin mənim qoyunlarıma bir ziyanı yoxdu ki?

– Heç bir ziyanı yoxdu, – dedilər, – əksinə xeyri var.

– Onda qoy nə qədər istəyir oxusun, – dedi Çoban, sürüsünü çəkib uzaqlaşdı...

***

*Bir adam uzaq yoldan gəlirdi, bərk yorulmuşdu, mənzilə çatmağa da hələ xeyli vardı... Allaha yalvardı ki, bir atlı göndər, məni tərkinə alsın, artıq yeriyə bilmirəm. Bir dedi, iki dedi, gördü budu, bir atlı gəlir, yanında da daylağı. Atlı çatan kimi kişini heç ağzını açmağa qoymadı: – Daylaq yorulub, – dedi, – götür dalına! Kişi nəsə demək istəyirdi, Atlı qılıncını azacıq qınından çıxardıb tiyəsini göstərdi. Kişi çar-naçar*

*daylağı aldı dalına, başını qaldırıb göyə baxdı dedi: – Saqqalı yanmış da yetirəndə tərsinə yetirir...*

***

Bu cür hekayətlərlə, detallarla (qırıntılarla) Xalq zaman-zaman özü öz münasibətlərinə aydınlıq gətirməliydi, gətirirdi də, çünki **Xalq** ayrı-ayrı adamlarıyla yox, bütöv halında **vaxta-zamana** bənzəyir, içini-çölünü aydınlatmalı, yaşayışının hər anına düzən verməlidir; dinini dəyişsə də, öz işindəydi, sürüsünü artırırdı, dolanışığını düzəldirdi, oğul-uşaq böyüdürdü. Bütöv halda götürsək, din öz möhtəşəm gücüylə ona təsir edə bilmirdi. Yuxarı təbəqələrdə məscidlər inşa edilib, dini mərasimlər keçirilsə də, xalq əslində öz işindəydi. Onun fikrini-düşüncəsini yalnız **təbiət hadisəsi dəyişdirə bilərdi.** Adət-ənənələri də bu cür köklənmişdi, yəni yazla, güzlə (payızla), bir söz, fəsillərlə bağlı idi. Toy-düyün adətləri əslində yazın-payızın tərkib hissəsi kimiydi. Bütün düyünlər qız görməkdən, qız seçməkdən, "hə"ni almaqdan elçiliyə, toya - düyünə, uşağa qalmaqdan uşağın doğulmağınacan öz vaxtına-zamanına bağlıydı; yaz özüylə öz yaşıllığını – tumurcuğunu gətirdiyi kimi, Xalqın da adət-ənənəsini cücərdirdi... Bir vaxtlar bu adət-ənənələr də dediyim kimi, vaxtın-zamanın içini doldururdu, vaxtdan ayrı deyildi. Hər şeyin öz vaxtı var idi... Baxmayaraq yeni din özünün yeni adətlərini təbliğ edirdi, yerli adətlərə qadağalar qoyur, aranı öz istədikləriylə doldurmağa çalışırdı. Yeni dinə görə qızlar, gəlinlər örtünməliydilər, ümumiyyətlə, qadın olan kəs görünməməliydi. Bu cür moizələr oxunurdu... Xalqsa, hə, desə də, çiyini qalxa-qalxa gülür, amma yaratdığını yaradır, sözünü deyir, sazını çalıb, mahnısını oxuyurdu.

Dəyirman üstü çiçək,
Oraq gətirin biçək.
Qardaş bir qız sevibdi,
Uzun boy, qara birçək...

**Deyişmə...**

*Günlərin birində eşitdim ki, aşıq dostum evlənib, ayınnan-uyunnan (şey-şüy) da alıb getdim təzə ailənin "gördüsünə". Xoş-beş, ordan-burdan, anrıdan-bəridən, hancarısan, necesən? Gəlinin ayağı sayalı, başı dövlətli, dırnağı bərk olsun, qulluğu-zadı necədi, göntöy, söz qaytaran deyil ki?*

*Pah, dediyimə peşiman olmadımmı? "Dəli qızın dərdi varmış", dost dediyim Aşıq cumub sazı götürmədimi? Balaca daxmada özünə yer eləyib: – Qulaq as, – dedi, – saznan deyim, söznən deyə bilmərəm.*

*Arvad aldım, bir ev qurdum özümə,*
*Küllüklərin külü yağdı gözümə.*
*On dörd put buğdanı verib özümə,*
*Yeyib içər, yenə doymadım deyər.*

*Dedim, əl saxla, ayıbdı, təzə gəlindi, eşidər, peşiman eləmə məni. Kimə deyirsən?! Saz sinəsində bir də dövran vurub, – Qulaq as, dedi, xəbərdən xəbərin yoxdu sənin:*

*Dedim allam, yıxıq evə dirəkdi,*
*Nə biləydim bir açılmaz kələkdi.*
*Hər öynədə yeddi qazan xörəkdi,*
*Soruşsan neçədi, saymadım deyər.*

*Dedim,-məni yaxşı qarşılamadın, qonağı gileylə qarşılamazlar.*
*Dedi, – soruşmusan, al cavabını:*

*Duran kimi qonşularnan dalaşar,*
*Xoruz təki al qanına bulaşar.*
*Qab-qacağı əl-ayağa dolaşar,*
*Üç ay keçib, hələ yumadım deyər.*

*Çəkilib durdum qıraqda: "Özü bilən məsləhətdi, yəqin necə deyir elədi" fikirləşdim. Elə bu vaxt gəlin o biri otaqdan güllə kimi çıxdı, boynuma alım ki, hələ bu vaxtacan belə qorxmamışdım. İrəli yeriyib sazı ərinin əlindən alıb: – Qonaq qardaş, – dedi, – bir mənim də dərdimə qulaq as!*

*Cəhrə deyib bəyir-bəyir bəyirdim,*
*İyə, tağalağa, muma səyirdim.*
*Üç ay keçdi, bircə cüt bağ əyirdim,*
*Onda bildim bədnəzərə gəlmişəm.*

*Gördüm bunnarın ki, mənnik deyil, arvad da aşıq çıxdı.*

*Çıxar evdən, papağını yan qoyar,*
*Bir bənd deyər, gözün yumar, uyuyar.*

*Öküz yeyər, nə bəs olar, nə doyar,*
*Təzə yurdda təzə gözə gəlmişəm...*

*Baxdım gördüm dostum bığaltı gülür, bildim ki, arada iş var. Dedim, bir az da gözləyim, görüm nə olacaq. Gəlin tapşırmasını deyirdi.*

*Bir də baxdın dərə keçdi, dağ aşdı,*
*Saz götürdü, elə bil ki, ağacdı.*
*Sual verdim, çaşdı qaldı, dolaşdı,*
*Görən deyər, mən də ərə gəlmişəm.*

*Söz tamama yetişdi, sən demə, zarafatları varmış. Dedim, bəs mənim suçum nədi ki, biriniz sağdan deyirsiz, biriniz soldan...*

*(davamı növbəti sayımızda)*

# MÜNDƏRİCAT

